# Mündəricat

# SƏLƏFİLƏR VƏ VƏHHABİLƏR

## KİTAB HAQQINDA

(Kitabın adı:[e١] [١] Sələfilər (Vəhhabilər

Müəllif: Nəcməddin Təbəsi

ƏRƏB DİLİNDƏN TƏRCÜMƏ: Hacı Tofiq Əsədov

(Naşir: (Ümumdünya İslam Elmləri Akademiyası

Çap növbəsi: Birinci

Çap tarixi: ٢٠٠٨

Tiraj: ٢٠٠٠

ISBN: ٩٧٨-٩٦۴-١٩۵-٠٠٣-۵

Ünvan: İran, Qum, Bahar prospekti Ümumdünya İslam Elmləri Akademiyasının .nəşriyyatı

Telfax : ٠٠٩٨ ٢۵١ ٧٧۴٩٨٧۵

E-mail: Public-Relations@Qomicis.com

səh:١

## İŞARƏ

## NAŞİRDƏN

İslam adı ilə özünü təbliğ edən "Sələfilik" və ya başqa sözlə desək "Vəhhabilik" ideoloqiyasının saxta, uydurma və qondarma olmasının əsas dəlili , bu təfəkkürün Həzrət Məhəmmədin(s) gətirdiyi əsl İslam dinindən əsrlər sonra yaranmasıdı. Özlərini tövhid carçısı və əsl müsəlman kimi göstərməyə çalışan vəhhabilər, əslində digər müsəlmanları şirk və küfrə ittiham etməkdən başqa heç bir mahiyyətə malik deyillər. Elə bu səbəbdən də, bütün müsəlmanlar vəhhabilik təfəkkürünü, Allah-taalanın bəşəriyyətə bəxş etdiyi pak , təmiz, məntiq və zəkaya uyğun İslam dini ilə tam mənada zidd olduğu üçün, rədd edirlər. Şübhəsiz ki, bu gün din alimlərinin öhdəsinə düşən əsas vəzifələrdən biri, cəmiyyəti sələfi-vəhhabi fitnəsindən agah etmək, hikmət və mərhəmətlə dolu İslamı, oldğu kimi müsəlmanlara çatdırmaqdır.

Sizə təqdim olunan "Sələfilər" adlı bu dəyərli əsər, böyük alim, ustad Şeyx Nəcməddin Təbəsininin qələmi ilə ərəb dilində yazılmış, Ümumdünya İslam Elmləri Akademiyasının aspirantı Hacı Tofiq Əsədov tərəfindən tərcümə olunaraq, siz əziz oxucularımıza təqdim olunur.

"ÜDİEA" tədqiqat şöbəsi hörmətli müəllifə, mütərcimə və kitabın işığ üzü görməsində zəhməti olmuş hər bir şəxsə dərin təşəkkürünü bildirir.

## MÜNDƏRİCAT

## ÖN SÖZ

Ey Peyğəmbər) sözü dinləyib onun ən yaxşısına tabe olanlara müjdə ver; onlar həmin)« insanlardır ki, Allah onları düz yola yönəltmişdir, məhz onlar əql sahibləridir.» (Zümər, (۱۷-۱۸

Əziz müsəlman azəri bacı və qardaşlarım! İslam dinimizin bizə xüsusi olaraq tövsiyə etdiyi vəhdət və birlik prinsipi yalnız əmələ yox, hətta əqidəyə də şamil olur. Biz bu ideyanı Allahın sonuncu kitabı olan Qur`ani-Kərimdən ilham alırıq. Qur`ani-kərim bu haqda buyurur: «Hamılıqla Allahın ipindən yapışın və heç vaxt aranızda təfriqə (salmayın.» (Ali-İmran, ۱۰۳

Bu zaman belə bir sual meydana gəlir ki, Qur`ani-kərimin birlikdən məqsədi, vahid bir həqiqətin ətrafında birləşmək və onun əsasında hərəkət etməkdir, yoxsa batil və əsassız inanclar altında toplaşmağa da şamil olur? Sözsüz ki, əgər Qur`ani-Kərim bizi birliyə və islami qardaşlığa də`vət edirsə, bu ünsürlərin yalnız İlahi çərçivədə olmasını, bizdən tələb edir. İlahi yolu tanımaq və o yol əsasında düzgün addım atmağın isə, hədsiz dərəcədə diqqətə, düşüncəyə və axtarışa ehtiyacı vardır. Çünki bəzi

məzhəblər və qruplar zahirdə din və İslam bayrağı altında birləşsələr də, həqiqətdə .azğın fikir və əqidələrinə görə cəhənnəm əhli sayılırlar

Lakin Allaha şükürlər olsun ki, aləmlərə rəhmət olaraq göndərilmiş Məhəmməd Peyğəmbər (s) haqq yolu öz hədisində ümmətinə tanıtdırmışdır. Şiə və sünnü mənbələrində yazılmış məşhur hədisdə Peyğəmbər (s) buyurur: «Mənim Əhli-beytim (ə) Nuhun gəmisi kimidir :O gəmiyə minən nicat tapacaq, ondan

(uzaqlaşan qərq və həlak olacaq.»(١)

Sözsüz ki, əgər Allaha düzgün şəkildə ibadət və itaət etmək istəyiriksə, gərək bu yolun düzgünlüyünü dinimizi bizə çatdıran, bəşəriyyətin həqiqi müəllimi olan Məhəmməd Peyğəmbər (s) və Qur`ani-Kərimdən öyrənək. Qur`ani-Kərimə gəldikdə, Məhəmməd Peyğəmbəri (s) hər bir məsələdə möminlərə nümunə qərar verib, onun əmrlərinə itaət etməyi vacib buyurmuşdur. Həmçinin Peyğəmbərin Əhli-beytini (Peyğəmbər(s), Həzrət Fatimə və on iki imamı (ə)) pak və məsum şəxslər kimi tanıtdırmışdır. Necə ki, buyurur: «Həqiqətən, Allah-taala hər növ (zahiri və batini) pislik və çirkinlikləri yalnız siz (Əhli beytdən uzaqlaşdırıb, sizi pak və məsum etmək istəyibdir.» (Əhzab, ٣٣

Məhəmməd Peyğəmbər (s) də özündən sonra ümmətinin yalhiz Qur`an və Əhli-beytə müraciət etməsini tövsiyə etmişdir. Şiə və əhli sünnənin mötəbər mənbələrində :Həzrət Peyğəmbərdən (s) belə nəql olur

Mən sizin aranızda iki qiymətli şeyi (əmanət) qoyub gedirəm. Biri Allahın kitabı, digəri» isə itrətim, yə`ni mənim əhli-beytimdir. Onlara bağlı olan vaxta qədər yolunuzu azmayacaqsınız. Onlar cənnətdə kövsər hovuzunun kənarında mənə qovuşanadək (heç zaman bir-birilərindən ayrılmayacaqlar.»(٢)

Bəli, nicat yolu yalnız Qur`ani-Kərim, Məhəmməd Peyğəmbər (s) və onun Əhli-beytidir(ə). Elə qarşınızdakı bu kitab da, Qur`ani-Kərimin İlahi tərəfindən xüsusi olaraq müəllim təyin olmuş Əhli-beytin (ə) ismət və əzəmətinə təkid etmiş, Həzrət Əlinin (ə) bütün səhabələrdən üstün olmasını sünnü mənbələrinə istinad edərək sübuta .yetirmişdir

Xatırladım ki, hazırkı kitabı tərcümə etmaklə yanaşı, bir sıra əsaslı məsələlərini də .müxtəsər şəkildə şərh etmişəm

Sonda Uca Allahdan arzum budur ki, bütün müsəlmanları bir-birlərinə qarşı mehriban !və səmimi etsin

Hacı Tofiq Əsədov

١- [١]. Hakim Nişapuri, «Müstədrək», c.٣. səh.١٥١ və...

٢- [٢]. «Səhihi-Müslim», c.٣. səh.١٨٠٣; «Sünəni-Termizi», c.٥. səh.٦٦٣ və...

## SƏLƏFILIK VƏ İBNİ TEYMİYYƏ .۱

### SƏLƏF VƏ SƏLƏFILƏR

Sələfilik əqidəsini araşdırmazdan qabaq, onun lüğətdə və dini terminlərdə işlənmiş mə`nalarına işarə etməyi zəruri sanırıq. «Sələf» ərəb lüğətində «keçmiş», «əcdad», «qabaqkı qövmlər» və «qədim ata-babalar» mə`nasında işlənmişdir.(۱) Dini istilahda isə, :bu sözün izahında alimlər müxtəlif nəzərlər söyləmişdir

Sələfilər", özlərini İslamın ilk dövrlərindəki dindarlara «oxşadan» bir qrupa deyilir." .۱ (.(Onlar hal-hazırda «vəhhabi» kimi tanınırlar

Sələfilər" dedikdə məqsəd, Məhəmməd peyğəmbərin (s) səhabələri, tabein və" .۲ tabeini-tabein nəzərdə tutulur.(۲) (Tabein – səhabələri görənlərə, tabeini-tabein isə (.İslam dünyasındakı üçüncü nəslə (səhabələri görənlərə) deyilir

Sələfilik" din, şəriət və məzhəbi başa düşməkdə, İslama ilk iman gətirənlərə" .۳ (müraciət etməkdir.(۳

Sələfilik" səhabə, tabein və onların davamçılarının yoluna qayıdış, həmçinin," .۴ (əqidəvi məsələlərdə fiqh imamlarına təqlid etməyə deyilir.(۴

Burada da fiqh imamlarından məqsəd, əhli-sünnənin dörd məzhəb başçıları nəzərdə) (.tutulur

.Sələfilik" və "vəhhabilik" arasında heç bir fərq yoxdur" .۵

səh:۱۳

---

«Əs-Sihah fil-lüğət», «Sələf» maddəsi; «Mucəmu-məqayisil-lüğət» . [۱] -۱

(Əs-Səhvətu və də`vət» Məhəmməd ibni Əbdül-Vəhhab, səh.۹ (Qərzavi» . [۲] -۲

Əs-Səhvətul İslamiyyət», səh. ۲۵» . [۳] -۳

(Əl-Əqaidul-Sələfiyyət», səh. ۱۱ (Əbutami» . [۴] -۴

Onların hər biri, pulun bir üzü kimidir. Onlar eyni əqidə və fikrə malik olsalar da siyasi və ictimai maraqlara görə özlərini – Ərəbistan yarımadasında vəhhabi, Ərəbistandan (kənarda Sələfi kimi tanıtdırırlar...(١

Vəhhabilər, tarix boyu müxtəlif və ağır cinayətlərə mürtəkib olduqları üçün, dünyada) «vəhhabi» adına qarşı kəskin bir nifrət hissi oyanmışdır. Bu məsələdən agah olan bəzi vəhhabilər, xarici ölkələrə təbliğə getdikdə, orada ifratçı əqidələrini təbliğ etmək naminə, adlarını dəyişməyə məcbur qaldılar. Elə bu səbəbdən də, özlərini sələflərə mənsub etməklə, «sələfilik» adı altında vəhhabiçilik əqidəsini yaymağa başladılar – (.Mütərcimdən

Bu günkü gündə gördüyümüz sələfilərin hamısı, əqidə baxımından İbni Teymiyyə və İbni Əbdülvəhabın, fiqhi nöqteyi nəzərdən(şəri hökümlərdə) isə, Hənbəli məzhəbli müftilərinin davamçılarıdır. Hətta bu müftilərin özləri İbni Teymiyyə və İbni Əbdülvəhabın əqidələrinə təqlid edib, onları mərcə, başçı və məzhəblərinin alimi sansalar da belə, özlərini vəhhabi adlandırmırlar. Çünki bu ad artıq mənfur bir isimə (çevrilmişdir.(٢

Vəhhabilər" və "Sələfillər" dedikdə (fiqhi baxımdan) Hənbəli məzhəbinə müraciət" .۶ edənlər nəzərdə tutulur. Əlbəttə, , vəhhabi və sələfi əqidəli insanların əksəriyyəti, Həmbəli məzhəbinin bir qisim məsələlərilə razılaşmırlar. Məsələn, Əhməd ibni Hənbəl və vəhhabi alimləri Ulu Tanrını cisim bildikləri üçün bu məsələdə müttəfiqdirlər.(Əksinə Əhli-beytə(ə) olan mövqelərində isə tam fərqlənhrlər. Çünki, İbni Hənbəlin Əhli-beytə (ə) olan sevgisi heç kimə gizli deyil.-Müt) Vəhhabilərə gəldikdə isə onlar Əhlibeytə(ə) (qarşı sevgisiz və bəzən də sayğısız olurlar.(٣

Vəhhabiyyət", Sələfilik təfəkküründən vücuda gəlmişdir. Məhəmməd ibni" .٧ Əbdülvəhhab camaatı İbni Teymiyyəyə və özlərini saleh sələflərə (Məhəmməd Peyğəmbərin (s) səhabələrinə) nisbət verən bir qrup mücəssimə əqidəli hənbəlilərə (tərəf də`vət edirdi.(۴

Nəticə: «Sələf»-dən məqsəd İslam dininin əvvəllərindən başlayaraq ilk üç əsrdə ,yaşayanlardır, «Sələfi» o kəsə deyilir ki

.özünü inanc, rəftar və ehkamda o əsrdə yaşayan sələflərin davamçısı kimi görür

Hal-hazırda isə «Sələfi» vəhhabi və bəzən də nasibilərə (Əhli-beytin (ə) düşmənlərinə) .deyilir. Bu məsələyə Həsən ibni Əli Səqqaf da təkid etmişdir

## SƏLƏFILIK HƏRƏKATININ MƏNŞƏYI

Əslində Sələfə qayıdış fikri Əhməd ibni Hənbəldən qaynaqlanıbdır. O, qədim Hind, Yunan və bu kimi bir sıra əcnəbi əqidə və mədəniyyətlərin müsəlman ölkələrinə hücum gətirdiyini müşahidə etdikdə, hədislərin qorunub saxlanması və təhrifdən amanda qalması fikrinə düşdü. Lakin onun yeni bir məsləkə üz gətirməsi əcnəbi əqidələrinin hücumundan daha pis oldu. Əhməd ibni Hənbəl ifratçı şəkildə sələfiyyətə üz gətirməklə, ağıl və məntiqi rədd edərək kənara qoydu. Hədis barəsində hansısa bir fikir söyləməyi qəti şəkildə haram saydı. Çox təəssüflər olsun ki, onun bu işinin axırı, .vəhhabiyyətin yaranmasında təsirsiz olmadı

Əhməd ibni Hənbəl Qur`an ayələri və Peyğəmbərin(s) sünnəsinin yalnız zahirinə baxıb və məntiqi şəkildə onların batini mənalarına diqqət yetirməmişdir. Onun özü bu haqda (deyir: «Biz hədisi necə görürüksə, onu eləcə də təsdiqləyirik.»(١)

Nəhayət bu metod zaman keçdikcə fikir və əqidə azğınlığına səbəb oldu. Buna nümunə olaraq Allahın cisim olması və Öz yaratdıqlarına oxşaması, Allahın (Öz ərşindən) asimanlara enməsi, və Onun üçün insanda olduğu kimi əl, üz və başqa bədən üzvlərinin təsəvvür və təsdiq edilməsini misal çəkmək olar.(٢) İbni Teymiyyə bu metodu (şiddətli və ifratçı şəkildə) davam etdirərək, müsəlman ümməti arasında ixtilaf və təfriqəyə səbəb oldu. Təbiidir ki, bu da, İslam düşmənlərinin xeyrinə .tamamlandı

.İnşaallah, bu məsələyə müstəqil mövzuda işarə edəcəyik

## SƏLƏFILƏR HAQQINDA ARAŞDIRMA

### ?İbni Teymiyyə kimdir

İbni Teymiyyə (٦٦١-٧٢٨ h.q) İslam aləmində bu ləqəblə tanınsa da, onun əsl adı Əbu ,Abbas, atasının adı Əbdülhəlimdir. O

Şam şəhərinin Hərran qəsəbəsində yaşayırdı. Monqol-tatarların Şama hücum etmək ehtimalından qorxduğu üçün, bu şəhəri tərk edərək, Dəməşqə tərəf üz gətirdi. Orada, Əhməd ibni Hənbələ mənsub edilmiş təcsim (Tanrını cisim sanmaq) və təşbih (Tanrını Öz yaratdıqlarına oxşatmaq) əqidələrini təbliğ etməyə başladı. Onun verdiyi fətvaların hamısı digər müsəlman alimlərinin fətvaları ilə tam zidd idi. Bunlarla yanaşı o, acıdil və qəzəbli adam idi. Nəhayət, İbni Teymiyyənin işi o yerə çatdı ki, İslam alimlərindən bir :çoxu onun əleyhinə kitablar yazdılar. Onlardan bir neçəsini nəzərinizə çatdırırıq

«Tacəddin. «Ət-tohfətül-muxtarə fir-rəddi əla munkiriz-ziyarə .۱

«Tacəddin. «Şəfaul-siqam fi ziyarəti xəyril-ənam .۲

«Təqiyəddin Subki. «Əd-dürrətul-muziə fir-rəddi əla İbni Teymiyyə .۳

Həmçinin, (şiə müctehidlərinin hamısı və) sünnü alimlərindən bir çoxu, o cümlədən İbni Həcər Əsqəlani (۸۵۲ h. q. vəfat), İbni Şakir Kətbi (۷۶۴ h. q. vəfat), İbni Həcər Heysəmi (۹۷۳ h. q. vəfat), Molla Əli Qari Hənəfi (۱۰۱۶ h. q. vəfat), Şeyx Mahmud Kövsəri Misri (۱۳۷۱ h. q. vəfat), Nəbhani (۱۲۶۵ h. q. vəfat), Əbu Bəkr Hesni Dəməşqi (۸۲۹ h. q. vəfat) və başqaları İbni Teymiyyəni kafir və yaxud fasiq adlandırmışlar.Biz bu məsələni sübuta yetirmək üçün bəzi sünnü alimlərindən (ixtisarla-ixtisar tərcümədə olmuşdur) sitatlar :gətiririk

Təqiyəddin Subki yazır: «İbni Teymiyyənin fikirləri bütün müsəlman xalqının fikirlərilə .۱ tam ziddiyyətdədir. O, dində bidət yaradıb, İslamın əsaslarını və müsəlmanların dini rəftarlarını məhkum etmişdir. Özünü Qur`an və Peyğəmbər (s) sünnəsinin təbliğatçısı saysa da, sonralar itaətdən çıxıb dində bidət yaratdı və özünü müsəlmanlardan (ayırdı.»(۱

Hesni Dəmeşqi yazır: «Doğrudan da, o, (İbni Teymiyyə) mürtəd olmuşdur. Hər kəs .۲ (onun dediklərinə etiqad bağlasa, ....»(۲

(İbni Həcər Heysəmi yazır: «Allah İbni Teymiyyəni üzüqara, ... və rüsvay etmişdir.»(۳ .۳

(Zəhəbi yazır: «İbni Teymiyyə yaxşı insanların qənimi olduğu üçün elə onun....»(۴ .۴

---

Ət- Təbəqatil- Şafeiyyə»,c.۱۰. səh.۱۸۶» . [۱] -۱

Əd-dürərul-kaminə»,c.۱. səh.۱۵۴; «Dəf`uş- şubhə», səh.۲۱۶» . [۲] -۲

Əl- fətavəl -hədisiyyə», səh.۸۶» . [۳] -۳

Təkmilətus-seyfil-seyqəl», səh.۱۹» . [۴] -۴

۵. Nəbhani yazır: «Dörd sünni məzhəbinin alimləri tərəfindən ibni Teymiyyənin məhkum olunması, günün günorta çağındakı günəş kimi aydın və aşkardır. Bütün dini şəxsiyyətlər onu, öz dar fikirlərinə əsaslanaraq Həzrət Peyğəmbərin (s) gətirdiyi dini təhrif etməsinə və müsəlman alimlərilə müxalifətə qalxmasına görə məzəmmət ediblər. Bunlardan əlavə, onun....»(۱)

۶. İbni Bəttutə yazır: «Onun (İbni Teymiyyənin....»(۲)

(Diqqət: İbni Bətutənin və yuxarıda sadaladığımız bəzi alimlərin sözlərini ixtisara salmağımızın və ya tərcümə etməməyimizin səbəbi, onlarin İbni Teymiyyə haqqında olan hədsiz dərəcədə kəskin bəyanları oldu. Baxmayaraq ki, bu bəyanatlar həmin alimlərin öz kitablarında, həmçinin kitabın əslində var idi. Biz isə sadəcə olaraq onları tərcümədə gətirməyi məsləhət bilmədik.- Mütərcimdən)

۷. İbni Həcər, İbni Teymiyyənin Həzrət Əliyə qarşı çıxması haqda yazır: «Mən Təqiyəddin Subkinin «Əl-istifa» kitabında İbni Teymiyyəyə olan tənqidlərini mütaliə etdim və gördüm ki, İbni Teymiyyəyə olunan tənqidlərin və tutulan iradların hamısı düzgündür. Həmçinin, İbni Teymiyyənin, İbni Mütəhhər Əllamə Hillinin yazdığı hədislərin hamısını saxta və qondarma bilib, o hədisləri rədd etməsi onun bir daha insafsız mövqe tutduğunu aydınlaşdırır. O, Əllamə Hillini inkar etmək üçün hətta bir çox səhih hədisləri kənara qoymuşdur.

Doğrudur, Əllamə Hilli hədisləri yazdığı zaman onları əzbər bildiyi üçün, öz hafizəsinin gücünə etimad edib, mənbələrə müraciət etməmişdir. Təbiidir ki, belə olan halda o, mənbələrin qeydində (nəinki hədislərin özündə) səhv edə bilər. Çünki insan unutqandır. Təəssüflər olsun ki, İbni Teymiyyə bunlardan əlavə çox vaxt şiələri təhqir etmək naminə həzrət Əlinin şəxsiyyətini belə aşağı gətirmişdir. İbni Teymiyyə və onun kimilərin iradları haqqında danışmağa bu kitab kifayət etmir...»(۳)

(Əllamə Hillinin böyük və təqvalı alim olmasını nəzərə alaraq, onun öz hafizəsinə etimad etməsi və bə`zi vaxtlar hədisin mənbəsinə müraciət etməməsi ehtimalı iki cür izah oluna bilər:

۱. O, əslində hədisi yazarkən etibarlı mənbələrə müraciət edirdi. Sadəcə olaraq, İbni

Teymiyyənin nəzərində o mənbələr mötəbər deyildi. Necə ki, İbni Teymiyyənin .mötəbər saydığı bir çox mənbələr, Əllamənin baxımından etibarsız sayılırdı



---

Təbəsi, «Ən-nəfyu vət-təğrib», səh.۱۰۹ . [۱] -۱

Ər-rehlə», səh.۹۵» . [۲] -۲

Lisanul-mizan»,c.۶. səh.۴۱۴» . [۳] -۳

٢. Təbiidir ki, hər bir sağlam və normal insan danışıb yazarkən öz hafizəsinə etimad edir. Xüsusilə, fövqəladə fitri istedada malik olan Əllamə Hilli kimi şəxsin öz hafizəsinə güvənməyə daha çox haqqı vardır. Allaha və Onun Rəsuluna (s) həqiqi və tam mənada iman gətirmiş Əllamə kimi şəxsiyyətlər, hər hansı bir məsələdə şəkk etdiyi zaman o məsələyə qarşı heç vaxt laqeyd yanaşmır, həmişə həqiqət dalınca olub onu olduğu kimi cəmiyyətə çatdırırlar.- Mürtərcimdən).

İbni Həcər başqa bir kitabında yazır: «İbni Teymiyyənin fikirləri qarşısında hər bir qrup müxtəlif əksüləməl göstərdi. Bir qrup onu «təcsim» əqidəsinin tərəfdarı kimi tanıyırdı.Çünki, o, «həməviyyə» və «vasitiyyə» əqidələrini təbliğ edir və deyirdi: «Allahın üzü, əli, ayağı və baldırı vardır, o, cismən ərşin üstündə durubdu...»

Başqa dəstə isə onu mürtəd adlandırdı. Çünki, İbni Teymiyyə deyirdi: «Məhəmməd Peyğəmbərdən kömək istəməyin heç bir faydası yoxdur!» Onun bu sözü Peyğəmbərin (s) əzəmətini aşağı salmaq və ona hörmətsizlik etmək sayılırdı.

Bir dəstə isə Həzrət Əli (ə) haqqında dediyi sözlərinə görə onu münafiq sanırdı. O deyirdi: «Əli on yeddi şeydə xəta etdi. Sonra həmin yerlərdə Qur`anın aşkar ayələrilə müxalifət etdi... Əli həmişə xar olurdu... Əli dəfələrlə xilafətə yetişməyə sə`y göstərdi, lakin əvvəlki üç xəlifənin zamanında öz hədəfinə çata bilmədi... O, dinə görə yox, hakimiyyət uğrunda döyüşdü... O, hakimiyyəti çox sevirdi... Əbu Bəkr yaşlı vaxtında iman gətirdi və nə dediyini başa düşürdü. Əli isə uşaq ikən iman gətirdi, halbuki, uşağın İslamı qəbul etməsi məqbul deyil.» Həmçinin, Həzrət Əlinin (ə) Əbucəhlin qızına elçi getməsini iddia etdi. Və bu səviyyədə olan fikirləri səbəb oldu ki, camaat İbni Teymiyyəni münafiq adlandırsin. Buna görə ki, Məhəmməd Peyğəmbər (s) buyurmuşdu: «Ey Əli, münafiq (ikiüzlü) insanlardan başqa heç kim sənə kin bəsləməz.»(١)

## İBNI TEYMIYYƏNIN KIN VƏ ƏDAVƏTINDƏN NÜMUNƏLƏR

### 1) İbni Teymiyyənin həzrət Əlinin (ə) ehkamlarına olan qərəzli nəzərləri

١. Əlinin bir çox fətvaları nəss, (Qur`ani-Kərim və Peyğəmbərin (s) açıq-aşkar söylədikləri) ilə ziddir.»(٢)

Şafei və Məhəmməd ibni Nəsrəl-Mərvəzi böyük həcmli bir kitab yazıblar ki, o» .٢ kitabda olan mətləblərin heç biri Əlidən nəql olunmayıbdır. Ona görə ki, başqa (səhabələr Qur`an və Peyğəmbərin (s) sünnəsinə Əlidən çox əməl edirdilər.»(١)

Əgər Əlinin tərəfdarları «Əli ilə döyüşənlər zalım və təcavüzkardırlar, çünki, səhih» .٣ hədisə əsasən, Peyğəmbər (s) Əmmar ibni Yasirə buyurur: «Səni təcavüzkar qoşun öldürəcək» – və Müaviyənin qoşunu onu öldürdü.» – desələr, mən (İbni Teymiyyə) :onların cavabında deyərəm

Bu haqda bir neçə nəzər mövcuddur. Bə`ziləri bu hədisin sənədini zəif bilib, onu kənara qoyublar. Bir qrup isə, hədisdəki «bağı» (təcavüzkar) kəlməsini, tələbkar mə`nasına təfsir ediblər. Əlbəttə, bu təfsir, çox da qənaətbəxş deyil. Lakin sələf və (sünni məzhəbinin) imamlarının çoxu, o cümlədən, Əbu Hənifə, Malik, Əhməd və s. (deyirlər ki, təcavüzkar tayfada olan sifətlər, onlarda yox idi»!(٢)

Əslində, Sünni məzhəbinin imamları, xüsusilə də Əbu Hənifə, Müaviyəni və onun) qoşununu həmişə təcavüzkar tanımışdır. Bu məsələni, onların yazılarından aydın (.şəkildə başa düşmək olur.– Mütərcimdən

Bilmirəm: bu kişinin (İbni Teymiyyənin) cahilliyinə gülüm, yoxsa onun qafilliyinə ağlayım?! Yaxud da onu, fikirlərinə görə rişxənd edim?! Sanki o, Əlinin (ə) elm və hikməti Peyğəmbərdən irs aparması barədə olan onlarla hədisi unutmuşdur. Həmçinin, Əlinin (ə) Allahın kitabına və Onun Rəsulunun(s) sünnəsinə hamıdan artıq olan elmini və onlara əməl etməkdə, bütün insanlardan seçilməsini yaddan belə .çıxartmışdır

:Həzrət Əlinin fəzilətinə aid olan bə`zi rəvayətləri nəzərinizə çatdırırıq

Peyğəmbər (s) buyurdu: «(Ey Fatimə,) sənin həyat yoldaşın, mənim ümmətimin ən .١ (böyük alimi və onların ən helmlisidir...»(٣)

Peyğəmbər (s) buyurdu: «Əli, mənim elmimin qapısı, ümmətimin mübəlliğidir. . ٢ (Məndən sonra yalnız o, ümmətin imamıdır.»(٤)

Peyğəmbər (s) buyurdu: «Hikmət, on qismə bölünmüşdür .٣

---

۱- [۱]. Əvvəlki ünvan

۲- [۲]. «Minhacus-sünnə», c.۸. səh.۲۸۱

۳- [۳]. Xətib, «Müttəfəq»-də və Süyuti «Cəmiul-cəvame» də c.۶. səh.۳۹۸

۴- [۴]. «Kənizül-ümmal»,c.۶. səh.۱۵۶ ; «Kəşful-xüləfa», c.۱. səh.۲۰۴

ki, onun doqquz qismini Allah, Əliyə əta etmiş, bir qismini isə, insanların arasında (bölmüşdür».(١

(Aişədən nəql olunur: «Əli, Peyğəmbərin (s) sünnəsini başqalarından daha çox bilir.»(٢ .۴

Ömərdən nəql olunur: «İlahi! Əli ibni Əbutalibin olmadığı vaxt,qarşıma heç bir çətinlik .۵ (çıxartma»!(٣

İmam Həsən (ə) Həzrət Əlinin (ə) şəhadətə yetişdiyi günün səhəri buyurdu: «Siz .۶ dünən elə bir kişidən ayrıldınız ki, ondan qabaqkılar və bundan sonra gələnlər onun (elmini dərk edə bilməzlər.»(۴

İbni Abbas deyir: «Allaha and olsun! Həqiqətən Allah, on elmin doqquzunu yalnız Əli .٧ ibni Əbutalibə bəxşiş etmişdir. Bununla belə, yerdə qalmış o bir elmdə də Əli sizinlə (şərikdir.»(۵

İbni Abbas dedi: «Mənim və Peyğəmbərin (s) bütün səhabələrinin elmi, Əlinin elmi ilə .٨ (müqayisədə, yeddi dənizin kənarında bir damcı kimidir».(۶

İbni Məsud dedi: «Qur`ani-Kərim yeddi hərf üstündə nazil olmuşdur ki, o hərflərdən .٩ hər birinin zahiri və batini mə`naları vardır. Doğrudan da Əli ibni Əbutalib, həmin (mə`nalara agahdır.»(٧

Udəy ibni Hatəm dedi: «Allaha and olsun! Əgər insanın dəyəri, Qur`an və .١٠ Peyğəmbərin (s) sünnəsinə bilikdədirsə, Əli, bunları hamıdan artıq bilir. Əgər şərafət, İslama iman gətirməkdədirsə, Əli, İslam Peyğəmbərinin (s) dini qardaşı və İslama iman gətirən ilk kişidir. Əgər insanın üstünlüyü onun zahidliyi və ibadətindədirsə, o, (insanların ən zahidi və abididir.»(٨

Abdullah ibni Həcəl ərz edir: «(Ey Əli), sən Rəbbimizə bizim hamımızdan çox agah, .١١ (Peyğəmbərimizə (s) bizim hamımızdan çox yaxın və dinimizə xeyirlisən.»(٩

Mərvəzi, Əbu Hənifənin, Əli ibni Əbutalibin (ə) fətvaları ilə

١- [١]. «Hilyətul-Əvliya», c.١. səh.٢۵ ; «Əsnəl-Mətalib», səh.١۴.

٢- [٢]. «Əl-İstiyab», c.٣. səh.۴٠ ; «Tarixul-xüləfa», səh.١١۵.

٣- [٣]. «Təzkirətul-xəvas», səh.٨٧.

۴- [۴]. «Əl-Bidayətu vən-nihayə», c.٧. səh.٣٣٠.

۵- [۵]. «Əl-İstiyab», c.٣. səh.۴٠.

۶- [۶]. «Mənabiul-məvəddət», c.١. səh.٧.

٧- [٧]. «Miftahus-Səadət», c.١. səh.۴٠٠.

٨- [٨]. «Cəmhərətu-xutəbil-ərəb», c.١. səh.٢٠٢ ; «Siyəru-Ə`lamul-nübəla «(xüləfa), səh.٢٣٩.

٩- [٩]. Əvvəlki ünvan

müxalifətçilik etdiyi məsələləri cəmləmiş və bir kitab təlif etmişdir. Kitabın mövzusu «Əbu Hənifənin Əli (ə) və İbni Məsudla müxalifətləridir.» Əgər bu kitabı diqqətlə mütaliə etsəniz, haqq və batili özünüz ayırd edə biləcəksiniz.

**۲) İbni Teymiyyə «Vilayət» ayəsinin izahında yazır...**

۲) İbni Teymiyyə «Vilayət» ayəsinin(۱) izahında

«Bə`zi yalançılar özlərindən saxta hədis düzəldərək demişlər ki, guya «Vilayət» ayəsi, Əlinin namaz qılanda – rüku halında sədəqə verdiyi üçün nazil olmuşdur. Halbuki, deyilənlərə görə, müsəlman alimləri bu məsələnin yalan olmasında icma etmişlər. Bu məsələnin yalan olması aydındır... Nəql olunmuşdur ki, elm əhli bu ayənin şəxsən Əli barəsində nazil olmasını, hətta Əlinin namazda öz üzüyünü sədəqə verməsini inkar edirlər. Ümumiyyətlə, elm əhli bu barədə olan rəvayəti saxta sayıb, ümmətin çoxunun bu xəbəri eşitməməsini söyləyirlər.»

Müəllif deyir: (Xətib, «Müttəfəq»-də qəti qərara gəlmişdir ki, «Vilayət» ayəsi Əli (ə) haqqında nazil olmuşdur.(۲) Həmçinin Süyuti ayənin Əlinin (ə) şə`ninə nazil olmasını isbat etmək üçün bu məsləyə açıq-aşkar işarə edən on iki rəvayət zikr etmişdir.(۳) Əl-iyci «Məvaqif» kitabında(۴) və Cürcani bu kitabın şərhində(۵) ayənin Həzrət Əlinin (ə) şə`nində nazil olmasını tə`kid etmişlər. Quşçi (İbni Teymiyyənin sözlərinin tam əksinə olaraq) deyir: «Elm əhli «Vilayət» ayəsinin Əlinin (ə) şəninə nazil olmasında icma etmişlər.»(۶)

**۳) İbni Teymiyyə sübh namazının izahında yazır ...**

«Əlidən nəql olunmuş səhih rəvayətdə gəlibdir: Allahın Rəsulu (s) mənim və Fatimənin qapısını döydü və buyurdu: «Sübh namazına durmursunuz?»

Dedim: «Ya Rəsuləllah, bizim varlığımız Allahın əlindədir. Əgər O istəsə biz namaza – qalxaq, qalxacağıq.»

səh:۲۱

---

۱- [۱] . «Həqiqətən, sizin vəliniz (rəhbəriniz) yalnız Allah, Onun Rəsulu və o kəslərdir ki,

(iman gətirib, namaz qılar və rüku halında zək verirlər.» («Maidə», ۵۵

Əd-dürrul-mənsur»,c.۲, səh.۲۹۳» . [۲] -۲

Əvvəlki ünvan . [۳] -۳

Əl-məvaqif fi elmil-kəlam», səh.۴۰۵» . [۴] -۴

Şərhul-məvaqif»,c.۸, səh.۳۶۰ » . [۵] -۵

Şərhi-Təcrid», səh.۳۶۸ ; «Ruhul-məani»,c.۶. səh.۱۶۸ ; «İbni Kəsirin təfsiri»,c.۲, səh.۶۴» . [۶] -۶

; «Əbu ibni Hatəmin təfsiri»,c. ۴, səh.۱۱۶۲

Bu zaman Peyğəmbər üzünü çevirib gedə-gedə dedi:» İnsan hər bir şeydən çox, cədəl (mübahisə) edəndir.»(١)

**...İbni Teymiyyənin cahillik və düşmənçilik ucbatından (۴**

İbni Teymiyyənin cahillik və düşmənçilik ucbatınd Əlinin, hamıya mə`lum olan ( ۴ fəzilətlərini inkar etməsi (٢)

(Kafirlərin Əliyə qəzəblənməsi heç bir yerdə görünməyibdir». (c.٨. səh.٩٧».١

Əlinin döyüşlərdə özündən göstərdiyi şücaətlər barəsində deyilmiş xəbərlərin» .٢ !!«hamısı yalandır

Peyğəmbərdən (s) nəql olunmuş «Mən, elmin şəhəriyəm, Əli onun qapısıdır» hədisi,».٣ (saxta hədislərdəndir. (c.٧. səh.٥١٥

Peyğəmbərdən (s) nəql olunmuş rəvayət:) «Əli sizin hamınızdan yaxşı qazidir», isbat )» .۴ (olmayıbdır. (c.٧. səh.٥٣٥

Halbuki, bu rəvayət şiə mənbələrindən əlavə əhli-sünnənin mötəbər mənbələrində) belə o cümlədən «Səhihi Buxarinin» ٣-cü cild, ٩٩-cu səhifəsi və «Müsnədi Əhmədin» ۶-cı (.cild, ١٣١ ci səhifəsində də yazılmışdır. –Mütərcimdən

(İbni Abbas, Əlinin şagirdi deyildi.» (c.٧. səh.٥٣٥» .٥

Bu rəvayət bir çox şiə və sünni mənbələrində zikr olunmuşdur. Həzrət Əlinin (ə) elmi) heç bir şəxsə sirr deyil. O Məhəmməd Peyğəmbərdən (s) sonra səhabələrin ən elmlisi idi. Bütün səhabələr bunu etiraf etdiyi kimi İbni Abbas da bu məsələni dəfələrlə demiş və təfsir elmini həzrət Əlidən (ə) öyrəndiyini söyləmişdir. Mənavi İbni Abbasdan nəql edir: «Mən təfsir elmində hər nə bilirəmsə Əlidən (ə) öyrənmişəm. («Feyzul-Qədir»,c.۴. (.səh.۴٧٠) – Mütərcimdən

(Əlinin Əbu Bəkrdən elm öyrənməsi məşhurdur» (c.٥. səh.٥١٣» .۶

Deyəsən, İbni Teymiyyə öz şeyxi və imamı Əhməd ibni Hənbəl, İsmayıl Qazi, Nəsai və Əbu Əli Nişapurinin sözlərini yaddan çıxartmışdır. (Onlar deyirlər:) «Mötəbər

hədislərimizdə Əlinin haqqında deyilən fəzilətlərin heç biri başqa səhabələr barəsində deyilməmişdir... Əli həmişə haqq ilə, haqq da həmişə Əli ilə olmuşdur». Qur`ani-Kərim haqqı görməyən şəxslərin barəsində necə də gözəl buyurmuşdur: «Onların zahiri (gözləri görsə də, batini gözləri (bəsirətləri, daxili və mənəvi hisləri) kordur.» (Həcc, ۴۶



---

.Minhacus-sünnə»,c. ۷,səh.۵۱۱, ۵۶۱» . [۱] -۱

MINHACUS-SüNNə» KITABıNDA» . [۲] -۲

## ...İbni Teymiyyənin ədavət üzündən Həzrət Əlinin (ə) ədaalətini (۵

İbni Teymiyyənin ədavət üzündən Həzrət Əlinin (ə) ədalətini inkar etməsi (۵

Əlinin hakimiyyət dövründə rəiyyətin çoxu onun ədalətsizliyindən şikayət edirdilər.» .١ Xəvaric, onu kafir sanırdılar. Qeyri-xəvaric, hətta öz yaxınları deyirdilər: «O, heç kimə insaf etmir.» Osmanın adamları onu, Osmana zülm etməkdə ittiham edirdilər... Əlinin ədaləti, onun rəiyyətinin çox olmağı ilə belə, Ömərin ədaləti qədər aşkar olmadı. (Ümumiyyətlə,(onların ədaləti arasında) fasilə çox idi!!(١

Səhabələrin çoxu Əliyə itaət və onunla beyət etmədilər. Əksinə, səhabə və tabeinin» .٢ (çoxu onunla müharibə etdilər.»(٢

## İbni Teymiyyənin Əlinin (ə) xilafəti və müharibələri barəsində olan nəzəri (۶

Əlinin xilafəti dövründə möminlərə Ömər və Osmanın zamanında olduğu kimi» .١ (şəfqət olmurdu.»(٣

Əli döyüşürdü ki, ona itaət etsinlər, təki bu minvalla insanların özünə və onların» .٢ !?əmlakına yiyələnə bilsin. Bəs bu necə dinə xatir döyüşməkdir

(Hər kim dünyada məqam və fəsad dalınca düşsə, axirətdə xoşbəxt olmayacaqdır.»(۴

Deyilənlərə görə, «Cəməl» və «Siffeyn» döyüşü üçün Əlinin Peyğəmbərdən heç bir» .٣ icazəsi yox idi. O, yalnız öz fikrinə əməl etdi. Elə buna görə də səhabələrin çoxu bu işdə onunla razılaşmadılar. Demək olar ki, bu döyüşlər fitnə idilər. Başqa ibarətlə desək, bunlar nə vacib cihad idi, nə də ki, müstəhəb. Lakin bu döyüşlər də namaz qılan, oruc tutan, zəkat verən və Peyğəmbərə salavat göndərən müsəlmanlardan bir çoxu qətlə (yetirildilər.»(۵

Müəllif:) Deyəsən, bu kişiyə hər şey tərsinə görünür. Göründüyü kimi o, Müaviyəyə) şəxsiyyət düzəltmək üçün, onun bütün günah və eyblərini Əlinin (ə) üstünə yıxır... !Allaha pənah aparıram gözün və batinin korluğundan

Mənavi, Cürcaninin «İmamət» kitabında söylədiklərinə istinad edərək yazır: «Hicaz və

İraqın istər əql, istərsə də hədis

səh:۲۳

---

Minhacus-sünnə»,c.۶, səh.۱۸» . [۱] -۱

Minhacus-sünnə»,c.۸, səh.۲۳۴» . [۲] -۲

Minhacus-sünnə»,c.۴, səh.۴۸۵» . [۳] -۳

Minhacus-sünnə»,c.۸. səh.۳۲۹ – c.۴.səh.۵۰۰» . [۴] -۴

Minhacus-sünnə»,c.۶. səh.۳۵۶» . [۵] -۵

tərəfdarı olan müctehidlərinin hamısı, o cümlədən Malik, Şafei, Əbu Hənifə, Əvzai və həmçinin dinşünas alimlər və müsəlmanların əksəriyyəti bu fikirdədirlər ki, Əli «Cəməl» «.əhli ilə haqqa görə döyüşdü və Əli ilə döyüşənlərin hamısı zalım və xainlərdir

Böyük sünni alimi Qurtəbi yazır: «Müsəlman alimlərinin yazdıqlarına və bir çox dini dəlillərə əsasən, Əli doğrudan da İmam olmuşdur və hər kəs ona qarşı çıxarsa xain sayılır. O, insanları haqqa və sülhə də`vət etmək üçün döyüşdü. Və belə bir döyüş də (vacibdir.»(«Feyzul-Qədir»,c.۶. səh.۳۳۶

**İbni Teymiyyənin xəlifələrin üç olmasına olan inadı (۷**

İbni Teymiyyə o kəslərdən idi ki, yalnız əvvəlki üç xəlifəni (Əbu Bəkr, Ömər və Osmanı) qəbul və bu əqidəni təbliğ edirdi. O deyirdi: «Üç xəlifə olmuşdur, dördüncü bir xəlifə yoxdur. Əgər dördüncü xəlifə qəbul olunarsa, o da Müaviyədir. Yox, əgər Müaviyə dördüncü xəlifə kimi tanınmazsa, deməli, həmin dövrdə xəlifə olmamış və hərc-«.mərclik hər yanı fitnə odu ilə doldurmuşdur

Bu fikrin kökü Abdullah ibni Ömərə qayıdır. İbni Teymiyyə kimi bəziləri də onun sözünü kor-koranə şəkildə qəbul etdilər. Buxari də bu məsələni öz kitabında yazdı. Sünni .məzəbinin rəhbərləri, o cümlədən Əhməd ibni Hənbəl də bu məsələyə toxundu

:İbni Teymiyyə yazır

Camaat Əlinin xilafətində şəkkə düçar oldular. Bir qrup dedi: «O, İmam deyildir,» .۱ Müaviyə imamdır.» Başqa bir dəstə isə dedi: «O zaman müsəlmanların vahid bir imamı (yox idi, fitnə-fəsad və hərc-mərclik dövrü idi.»(۱

Şafei və başqalarından nəql olunmuşdur: «Xəlifələr üçdür: Əbu Bəkr, Ömər və» .۲ (Osman.»(۲

O dövrdə bə`zi müsəlmanlar Əlinin qarşısında sükut etsələr də, onu dördüncü xəlifə» .۳ kimi qəbul etmirdilər. Çünki, ümmətin hamısı onunla bey`ət etməmişdi. Bəni-Üməyyədən bir çoxu deyirdi: «Hal-hazırda ölkədə xəlifə yoxdur. Buna görə ki, xəlifə ilə hamı beyət etməlidir. Lakin Əli ilə hamı beyət etməmişdir.» Hətta Bəni-Üməyyədən bir neçəsi cümə

namazlarında Müaviyəni dördüncü xəlifə kimi tanıtdırır, üç xəlifənin adını çəkdikdən sonra Müaviyənin adını çəkir, Əlinin adını isə dillərinə gətirmirdilər.»(۱)

۴. «Biz bilirik ki, Əli, hakimiyyətə çatdığı zaman camaatın əksəriyyəti Müaviyəni və yaxud başqa bir şəxsi özlərinə rəhbər seçmişdilər... Ümumiyyətlə, ümmətin çoxu Əliyə itaət etməyi qəbul etmirdilər.»(۲)

(Müəllif:) Baxın görün: İbni Teymiyyə Həzrət Əli (ə) ilə necə düşmənçilik edib, Əməviləri (Müaviyə və Yezidin nəslini) tərifləyir, özünü Müaviyənin çirkin sultanlığının məddahı (tə`rif edəni) kimi tanıtdırır!! Həzrət Məhəmməd Peyğəmbərin (s) Əlinin (ə) şəxsiyyəti haqqında buyurduqları kəlamların hamısına biganə yanaşır! Allah Taala Əhli-beytin düşmənlərini zəlil və xar etsin!



---

۱- [۱] . «Minhacus-sünnə», c.۶. səh.۴۱۹.

۲- [۲] . «Minhacus-sünnə», c.۴. səh.۶۸۲.

## ۲. HƏZRƏT ƏLİ (Ə) VƏ ŞİƏLİK

### MÜAVIYƏÇILƏR VƏ ƏLININ (Ə) XILAFƏTI HAQQINDA...

(Müaviyəçilər və Əlinin (ə) xilafəti haqqında söylənilənlər (sünni mənbələrində

۱. Əbul-Qeys Əvdi(۱) deyir: «İnsanları üç dəstədə gördüm: Birinci dəstə Əlini sevənlərdir ki, onlar əsl iman əhlidirlər. İkinci və üçüncü dəstə isə, dünyaya məftun olduqları üçün ya Müaviyəni, yaxud da ki, xəvarici xoşlayırdılar.»(۲)

۲. Əhməd ibni Hənbəl demişdir: «Hər kəs Əlinin xilafətini qəbul etməsə uzunqulaqdan da əskik sayılır. Məgər Əli, qanun icra edərkən və yaxud zəkatları toplayıb, onları təqsim etdiyi zaman ədalətsizlikmi edirdi?! Allaha pənah aparıram belə bir sözdən! Əksinə, Əli elə bir xəlifə idi ki, Peyğəmbərin (s) bütün səhabələri ondan razı idilər; onun kənarında döyüşüb onunla birgə cihad edir, həcc əməlini yerinə yetirirdilər. Səhabələr onu «Əmirəl-mö`minin» adlandıraraq, ona itaət edirdilər. Biz də ona itaət edənlərdənik.»(۳)

۳. İbni Hənbəl yenə yazır: «Hər kəs Əlinin dördüncü xəlifə olmasını inkar etsə, onunla danışmayın; və ona nə qız verin, nə də ki, ondan qız alın.»(۴)

۴. Abdullah ibni Əhməd: deyir «Atamdan soruşdum ki,

səh:۲۷

---

[۱] -۱. Əbl-Qeys Əvdi, əsl adı Əbdür-Rəhman ibni Sərvandır. İbni Muin onun mötəbər şəxs olmasını sübut etmişdir. (۱۳۰ h. q. vəfat). «Mizanul-etidal», c.۲. səh.۵۵۲

[۲] -۲. «Əl-İstiyab», c.۳. səh.۲۱۳, Darul-kutubil-elmiyyə».

[۳] -۳. «Əimmətul-fiəhut-tisə», səh.۸».

[۴] -۴. «Təbəqatul-hənabilə», c.۱. səh.۴۵».

bəziləri «Əli, xəlifə deyil» deyirlər, atam cavabımda buyurdu: «Bu çox çirkin və pis sözdür.»(1)

## SƏLƏF VƏ RAVILƏR BAXIMINDAN ƏLININ (Ə) BAŞQALARINDAN ÜSTÜNLÜYÜ

(Sələf və ravilər baxımından Əlinin (ə) başqalarından üstünlüyü (sünni mənbələrində

1. Harun ibni İshaq, Yəhya ibni Muindən belə nəql edir: «Hər kəs, Əbu Bəkr, Ömər, Osman və Əlini tanısa, və Əlinin İslamı onlardan öncə qəbul etməsinə, fəzilət və insani keyfiyyətlərdə onlardan üstün olmasına iman gətirərsə, sünnəyə əməl etmiş sayılır.» Yəhyaya dedim ki, bə`ziləri Əbu Bəkr, Ömər və Osman deyib sonra sakit qalır. Yəhya, belə bir şəxslərin haqqında gileylənməyə başladı.»(2)

2. Abbas ibni Dəvri, Yəhya ibni Muindən belə nəql edir: «Peyğəmbərdən sonra bu ümmətin ən yaxşı şəxsi Əbu Bəkr, Ömər, Osman və Əlidir. Bu bizim rəhbərimizin sözüdür.» Sonra Yəhya ibni Muin öz-özünə deyirdi: «Əbu Bəkr, Ömər, Əli, Osman.»(3)

3. Əbu Ömər (İbni Əbdülbirr) yazır: «Hər kəs ibni Ömərin dediyi , «Bizim əqidəmizə görə Peyğəmbərin (s) zamanında yalnız Əbu Bəkr, sonra Ömər, sonra Osman fəzilətli olublar.» – sözünü desə, belə bir şəxs İbni Muini inkar etmiş sayılır. İbni Muin bu cür əqidəli insanların haqqında çox sərt danışmışdır. Çünki, belə bir əqidəyə malik olan şəxslər bütün müsəlmanların, o cümlədən fiqh və əsər sahibi olan səhabə və ravilərin tam əksinə rəftar edir. Doğrudan da, Əli, Osmandan sonra camaatın ən üstünüdür. Bu məsələdə heç kimin ixtilafı yoxdur. Sadəcə olaraq ixtilaf burdadır ki, Əli üstündür, yoxsa Osman? Bə`zən səhabələr, Əli və Əbu Bəkrin haqqında müzakirə ediblər ki, görəsən hansı daha üstündür. Bütün bu söylədiklərimizə əsasən, İbni Ömərin dedikləri yersiz və mə`nasızdır. Hətta onun sözlərinin sənədi düz də olsa, məfhumu yoxdur.»(4)

Müəllif:) Gördüyünüz kimi, səhabə və ravilər Əlinin (ə) başqa səhabələrdən üstün) olmasını rəvayət edirlər. Həmçinin, əhli-sünnə deyir: «Əli (ə), dördüncü xəlifədir.» İbni Teymiyyə



---

1- [1]. «Əs-sünnətul- həlal», səh.235».

Əl-istiyab», c.٣. səh.٢١٣ » . [٢] -٢

Əvvəlki ünvan . [٣] -٣

Əl-istiyab», c.٣. səh.٢١۴» . [۴] -۴

isə, Əlinin (ə) xilafətini inkar və yaxud onun xilafətində (xilafətinin şər`i və qanuni olmasında) şəkk edir, Əlinin (ə) bütün fəzilətlərini inkar etməklə yanaşı, onun haqqında heç bir müsəlmanın söyləmədiyi sözləri deyir. Bunlara baxmayaraq, yenə də ona (İbni Teymiyəyə) sələfi və sünni deyirlər!! Əslində isə o, nə sələfidir, nə sünni...

## SƏHABƏ VƏ TABEININ HƏZRƏT ƏLI (Ə) HAQQINDA...

(Səhabə və tabeinin Həzrət Əli (ə) haqqında nəzərləri (sünni mənbələrində

١. İbni Əbdülbirr yazır: «Salman, Əbuzər, Miqdad, Xəbbab, Cabir, Əbu Səid Xudri və Zeyd ibni Ərqəmdən rəvayət olunubdur ki, «həqiqətən Əli ibni Əbu Talib İslam dininə iman gətirən ilk şəxsdir». Adlarını çəkdiyimiz səhabələrin hamısı Əlini (ə) bütün səhabələrdən üstün bilirdilər.»(١)

٢. Zəhəbi deyir: «Həkəm ibni Ütəybə (۴۶ h. q. vəfat) Kufənin böyük alimi və dini rəhbəri idi, həmçinin, əhli-sünnə və tabeindən sayılırdı. O, Əlini (ə) Əbu Bəkr və Ömərdən üstün bilirdi.»(٢)

## «ŞİƏ» SÖZÜNÜN SƏHABƏLƏR ARASINDA MƏŞHUR OLMASI

Sünni mənbələrində yazılır: «Dini terminində «şiə» sözünün mə`nalarından biri budur ki, şiə Əlini (ə) Peyğəmbərdən (s) aldığı tərbiyə və fəzilətlərinə görə, digər xəlifələrdən üstün bilir. Ümumiyyətlə, səhabə və tabeinin çoxu şiə olmuşdur.»(٣)

١. Zəhəbi yazır: «Şiəçilik ya ifratçı ya da normal və düzgün şəkildədir. Doğru dindar və təqvalı şiə, tabein və onların ardıcıllarının arasında çox olmuşdur. Əgər şiələrin rəvayət etdiyi hədisləri e`tibarsız saysaq, onda gərək bir çox dini əsərləri kənara qoyaq. Bu isə açıq şəkildə fitnə-fəsad deməkdir...

Sələfin vaxtında ifratçı şiə o kəslərə deyilirdi ki, Osmana, Zübeyrə, Təlhəyə, Müaviyəyə və Əli (ə) ilə müharibə və düşmənçilik edənlərə qarşı qəzəbli olub, onlar haqda pis sözlər danışsınlar. Sonra yazır: Əban ibni Təğləb (böyük sələflərdən biri olmuşdur) Əlini iki şeyxdən (Əbu Bəkr və Ömərdən) üstün bilirdi.»(۴)

۱- [۱]. «Təhzibul-kəmal», c.۲۰. səh.۴۸۰.

۲- [۲]. «Siyəru ə`lamil-nübəla», c.۵. səh.۲۰۹.

۳- [۳]. «Ricalul-şiə», səh.۹; «Məqalatul-İslamiyyin», səh.۵; «Müqəddimətu-İbni Xəldun», səh.۱۹۶; «Xutətuş-Şam», c.۶. səh.۲۴۵...

۴- [۴]. «Mizanul-etidal», c.۱. səh.۶.

Səhabələrdən bir çoxunun Əlini (ə) səmimi-qəlbdən sevmələri, onu başqa» .۲ səhabələrdən üstün bilib, hətta özlərindən belə, öndə tutmaları isbat olunmuş bir məsələdir. Səhabələr Əlini (s) sevməyi imanın nişanəsi, onunla düşmənçiliyi isə münafiqlik və ikiüzlülük kimi başa düşürdülər. O zaman Haşimilərin hamısı Əlinin (ə) şiələri idilər. Həmçinin, Hüzeyfə ibni Yəman, Zübeyr ibni Əvam, Xəzimə Zuş-şəhadəteyn, Əbu Teyhan, Haşim ibni Ütbə (Mirqal), Əbu Əyyub Ənsari, Əbu Səid Xudri,(۱) Əbu Rafe, Udəy ibni Hatəm Tai, Hucr ibni Udəy Kəndi, Səid ibni Cubeyr, Osman ibni Hüneyf, Səhl ibni Hüneyf, Ubəy ibni Kə`b, Bərra ibni Azib, Əhnəf ibni Qeys, Sabit ibni Qeys ibni Xətim, Qeys ibni Sə`d ibni Übadə və onun atası, Xəbbab ibni Ərət, Peyğəmbərin (s) azançısı Bilal, Abdullah ibni Budeyl, Məhəmməd ibni Budeyl, Qərzə ibni Kə`b Xəzrəci, Süleyman ibni Surəd Xüzai, Ənəs ibni Hərəs, Əbu Qütadə Ənsari, Əbu Ducanə Ənsari, Sə`d ibni Məsud Səqəfi (Muxtarın əmisi), Yezid ibni Nuveyrə, Nafe ibni Ütbə, Əbu Leyla Ənsari (Davud ibni Bilal-Yəsar) və s. o zaman Əlinin (ə) şiələrindən sayılırdılar. Əli (ə) Mədain şəhərinə gəldikdə Əbu Leyla onunla birgə idi və «Siffeyn» döyüşündə Əlinin (ə) yolunda şəhid oldu. Onun övladlarının əksəri alim və fəqih idilər. O, Həzrət Əlini o qədər sevirdi ki, Əli (ə) yol gedəndə yol gedir, Əli dayananda (dayanardı. Nəhayət siffeyn döyüşündə şəhid oldu. (۲

Zəhəbi və İbni Həcər yuxarıda adlarını çəkdiyimizi səhabələrdən başqa bir neçə .۳ səhabəni də Əlinin (ə) şiələrindən saymışlar: Əbu Tufeyl, Əbu Bəkrlə beyət etməyən ...səhabələr (başda Bəni- Haşim olmaqla), həmçinin Salman, Əbuzər, Əmmar, Miqdad

Fiqh və hədis elminin mütəxəssisləri Əlini (ə) Osmandan üstün bilirdilər. Zəhəbi :onlardan bir neçəsinin adını öz kitabında qeyd etmişdir, o cümlədən

Əl-Ə`məş, Süleyman ibni Məhran .۱

Nö`man ibni Sabit .۲

Şö`bət ibni Həccac .۳

Əbdürrəzzaq Sənani .۴

Ubeydullah ibni Musa .۵

---

Xudri deyirdi: Peyğəmbərin (s) vaxtında Əli (ə) ilə düşmənçilik edənlərin hamısı . [١] -١
.münafiqlər (ikiüzlülər) idi

İmam Buxari və Səhifətul-came», səh.١۶٨» . [٢] -٢

(Əbdurrəhman ibni Əbi Hatəm(١ .۶

(Süfyan Suri(٢ .٧

## İLK ŞİƏÇİLİK SƏHABƏLƏRDƏN BAŞLAMIŞDIR

Əbu Hatəm Razi yazır: «İslamda ilk məzhəb «şiə» məzhəbi olmuşdur. O zaman bu .١ (ləqəb dörd səhabəyə – Əbuzər, Əmmar, Miqdad və Salmana deyilirdi.»(٣

Əhməd Əmin deyir: «Şiəçilik səhabələrdən başlamışdır. Onlar Əliyə olan .٢ məhəbbətlərində sadiq idilər və özünəməxsus fəzilətlərinə(۴) görə Əlini imamətə daha layiq bilirdilər. Belə bir əqidəyə malik olanların ən tanınmışı Salman, Əbuzər və Miqdad (idi.»(۵

Sübhi Saleh deyir: «Səhabələrin arasında, hətta Peyğəmbərin (s) zamanında belə, bir .٣ çox şiə- Əli şiəsi var idi. O cümlədən, Əbuzər, Miqdad... Cabir ibni Abdullah, Ubəy ibni (Kə`b, Əbu Tufəyl, Abbas və onun bütün övladları, Əmmar və Əbu Əyyub...»(۶

Beləliklə,aydın olur ki, fiqh və əsər sahibi olan səhabə və tabeindən bir çoxu, «şiə» məfhumunun Məhəmməd Peyğəmbərin (s) öz zamanında işlənməsinə təkid etmişlər. Deməli, əgər İbni Teymiyyənin sözünü və nəzərini səhabə və tabeinin nəzərləri ilə .müqayisə etsək, bunların arasında olan ziddiyyətlər açıq-aydın şəkildə mə`lum olar



---

Mizanul-etidal»,c.٢. səh.۵٨٨» . [١] -١

Siyəru ə`lamil-nübəla»,c.٧. səh.٢۵٢» . [٢] -٢

Əz-zinətu fi kəlimatil-İslamiyyə»,c.٣. səh.١٠» . [٣] -٣

Əhməd ibni Hənbəl, İsmayıl Qazi, Nəsai və Əbu Əli Nişapuridən nəql edirlər ki, . [۴] -۴ demişlər: « Həzrət Əlinin barəsində səhih sənədlərlə deyilmiş fəzilətlər, heç bir səhabənin barəsində deyilməmişdir». «Fəthül-Bari», c.٧. səh.٨٩ ; «İbni Əsakirin tarixi», c.٣. səh.٨٣

Zöhəl-İslam»,c.٣. səh.٢٠٩» . [۵] -۵

Ən-nəzmul-İslamiyyə», səh.٩۶» . [۶] -۶

### SƏLƏFİLƏRİN PEYĞƏMBƏR(S) SÜNNƏSİNƏ QARŞI ÇIXMALARI .٣

### SƏLƏFİLƏRİN İNADKARLIĞI

#### İşarə

Burada belə bir sual verilir ki, fiqh və əsər sahibi olan sələfilər və ondan sonrakı nəsillər, görəsən Məhəmməd Peyğəmbərin(s) bütün sünnələrinə (Peyğəmbərin(s) buyuruqları və rəftarları) itaət edirdilərmi? Yoxsa, Həzrət Əli(ə) və ya şiələrə olan düşmənçilikləri ucbatından (necə ki, özləri də bu məsələyə işarə etmişlər) və bə`zən də digərlərinə olan ifrat məhəbbətin nəticəsində Qur`an və sünnə ilə inad edərək (müxalifət etmişlər? Şahidləri dinləyək: (Sünni mənbələrində

#### Bə`zi müstəhəb əməlləri tərk etmək .١

Bə`zi müstəhəb əməlləri tərk etmək .١

İbni Teymiyyə yazır: «Müftilərdən bir qismi şiələrin xüsusi diqqət yetirdikləri bə`zi müstəhəb əməlləri tərk etməyi lazım bilirlər. Doğrudur, bu tərk, vacib həddində deyil, lakin belə müstəhəb əməlləri yerinə yetirmək bir növ özünü şiələrə oxşatmaq deməkdir. Belə olan halda sünni şiədən seçilməyəcək. Şiələrdən seçilmək, onlardan uzaqlaşmaq və müxalif olmaq üçün bu cür müstəhəb əməlləri yerinə yetirməmək (daha məsləhətə uyğundur».(١)

#### Əmmamə dolamaq .٢

İraqi, əmmamə bükməyin forması haqda yazır: «Təbəranidən



---

Zərqani, «Şərhul-məvahib»,c. ٥. səh.١٣ . [١]-١

nəql olunmuş zəif bir hədisdən başqa, heç bir rəvayətdə görmədim ki, əmmaməni sağ tərəfdən bükmək lazımdır. Hətta bu hədisi səhih hədis kimi qəbul etsək və «Peyğəmbər (s) əmmaməni sağ tərəfdən büküb sonra onu sol tərəfə dolayırdı», desək belə, (necə ki, bə`zi alimlər belə edirlər) lakin bu cür bükmək şiələrə məxsus olduğu üçün, daha (yaxşı olar ki, onlara oxşamayaq deyə, belə bükülməsin.» (Şərhül-məvahib, c.۵, səh.۱۳

**Qəbrin (sinə daşının) müsəttəh olması .۳**

Qəbrin (sinə daşının) müsəttəh(۱) olması .۳

Qəzzalinin fiqh kitabı olan «Vəciz» də və habelə, bu kitabın şərhində (Fəthul-vəziz fil-fiqhiş-Şafei) yazılmışdır: «Qasim ibni Məhəmməd ibni Əbu Bəkr deyir:» Peyğəmbərin (s), Əbu Bəkrin və Ömərin qəbrinin üstünün müsəttəh (müstəvi şəkildə) olmasını gözümlə «.gördüm

İbni Əbi Hüreyrə(۲) isə deyir: «Daha yaxşı olar ki, sinə daşını müsəttəh yox, yumru edək. Çünki, şiələr qəbirlərinin üstünü müsəttəh edirlər. Bizim onlarla müxalifət (etməyimiz daha məsləhətə uyğundur.»(۳

**. Peyğəmbərdən (s) başqasına salavat göndərmək .۴**

Zəməxşəri (۵۳۶ h. q. təvəllüd) yazır: «Əgər soruşsanız ki,» Peyğəmbərdən (s) başqasına salavat göndərmək haqqında nə deyə bilərsiniz?» Deyərəm: Allah Taalanın buyurduğuna əsasən, hər bir mö`minə salavat göndərmək olar. Necə ki, Qur`ani-Kərimdə buyurur: «Allah sizə salavat göndərir.» (Əhzab, ۴۳) Başqa bir ayədə buyurur: «(Ey Peyğəmbər) Günahkarlara salavat göndər, çünki, sənin salavatın onların (sakitliyinə səbəb olur». (Tövbə, ۱۰۳

Həmçinin, Peyğəmbər (s) buyurur: «İlahi, mənim atamın sülaləsinə həmişə salavat göndər». Lakin alimlərin nəzəri budur ki, salavatı yalnız Peyğəmbərə göndərmək olar. Peyğəmbərin Əhli-beytinə isə, Peyğəmbərin (s) kənarında salavat çəkmək olar: «İlahi, «.salavat göndər Peyğəmbərə və onun ailəsinə

Peyğəmbərin ailəsinə (Əhli-beytə) salavat göndərmək isə (məs: (Əli əleyhissəlam) deməki) məkruhdur. Çünki, salavat

---

Sinə daşının dördbucaq şəklində düzəlməsi, yerdən dörd barma ucalması və. [۱] -۱ ..üstünün düz(müstəvi) olması

...Zəhəbi yazır: İbni Əbu Hüreyrə Şafeilərin şeyxi və rəhbəridir . [۲] -۲

Nəvəvi Əl-məcmu», c. ۵. səh.۲۲۹ ; «İrşadus-sari»,c. ۲. səh.۴۶۸» . [۳] -۳

Peyğəmbərə aid olunur. Bundan əlavə, Əhli-beytə salavat göndərən, şiə adı ilə müttəhim olunur.»(١)

### Peyğəmbərlərdən(s) başqasına salam söyləmək .۵

İbni Həcər yazır: «Şəriətə əsasən insanlar diri olduqları halda bir-birlərinə salam verə bilərlər. Bu məsələni bütün alimlər qəbul edirlər, lakin onlar Peyğəmbərdən (s) başqasına (dünyadan köçdükdən sonra) salam göndərməklə əlaqədar müxtəlif fikirlər söyləmişlər. Bə`ziləri hər bir diri, yaxud dünyasını dəyişmiş insana salam (rəhmət) göndərməyi caiz bilir. Bir sıra alimlər də peyğəmbərin (s) ardınca dünyadan köçənlərə salam söyləməyi caiz bilirlər. Lakin mərhum bir fərdə salam (rəhmət) göndərmək caiz deyil. Çünki, bu işi şiələr görür. Bu məsələni Nəvəvi, Şeyx Əbu Məhəmməd Cuveynidən nəql etmişdir.»(٢)

### Əmmamə bükməyin forması .۶

Əmmaməni gərək Peyğəmbərin (s) bükdüyü kimi başımıza dolayaq və bu əsl,» sünnəyə əməl etməkdir. Amma bu gün Peyğəmbər (s) kimi əmmamə dolamaq şiənin böyük alimlərinə aid olduğu üçün, onlara oxşamamaq naminə, biz bu işi görməməliyik.»(٣)

### Səhabə sözünün Peyğəmbər(s) sünnəsinə üstünlüyü .٧

SəHABə SöZüNüN PEYğəMBəR(S) SüNNəSINə üSTüNLüYü .٧

Bəğəvi yazır: «Müstəhəb namaz camaatla qılınmalıdır, yoxsa fərdi şəkildə? İki cür cavab verilir: ١. Camaatla qılınsa daha fəzilətlidir. Çünki Ömər camatı Ubəy ibni Kə`bin arxasında müstəhəb namaz qılmaq üçün də`vət etdi. ٢. Fərdi qılmaq daha fəzilətlidir. Çünki Peyğəmbər (s) qəməri aylardan birində gecə namazlarını məsciddə qılırdı. Sonra ayın qalanını məscidə getmədi və buyurdu:«Öz evinizdə namaz qılın! Müstəhəb namazları evdə qılmaq daha fəzilətlidir...» Birinci nəzər düzgündür...»(۴)

(!!!Yə`ni, səhabənin sözü Peyğəmbərin (s) sünnəsindən qabağa keçir)

Təfsirul-Kəşşaf»,c. ٣. Səh.٥٤١. Darul-kutubil-elmiyyə» . [١] -١

Fəthul-Bari»,c.١١. səh.١٤٢» . [٢] -٢

Şərhul-Məvahibil-lədunniyyə»,c.٥. səh.١٣» . [٣] -٣

Ət-təhzib fi fiqhiş-Şafei»,c.٣. səh.٢٣٢» . [٤] -٤

### Peyğəmbər(s) sünnəsinin qarşısında Müaviyənin mövqeyi .۸

:a) Sol ələ üzük taxmaq

İlk dəfə Peyğəmbərin(s) sünnəsinin əksinə olaraq sol ələ üzük taxmaq Müaviyə» (tərəfindən baş verdi».(۱

:b) Təlbiyəni (həcdə ləbbeyk deməyi) tərk etmək

Səid ibni Cubeyr belə nəql edir: İbni Abbasın kənarında həcc əməlini yerinə yetirirdik. O məndən soruşdu: «Ey Səid, təlbiyə səsi eşitmirəm?!» Dedim: «Camaat Müaviyədən qorxur.» Bu zaman o, öz çadırından çıxıb təlbiyə deməyə başladı: «Ləbbeyk, Əllahummə ləkə ləbbeyk, hətta Müaviyə istəməsə də ləbbeyk, İlahi, Əliyə (ə) olan kinləri «!ucbatından Peyğəmbərin (s) sünnəsini tərk edən şəxslərə lənət et

Sindi yazır: «Əli (ə) həmişə Peyğəmbərin (s) bütün sünnəsinə əməl edirdi. Müaviyə (kimilər də ona olan kin-küdurət üzündən Peyğəmbərin (s) sünnəsini tərk edirdilər».(۲

:c) Peyğəmbərin(s) hədislərinə etinasız yanaşmaq

İbni Əsakir, Rəca ibni Heyvətdən nəql edir: «Müaviyənin həmişə hədis deməkdən acığı gəlirdi və bizə tapşırırdı ki, Peyğəmbərdən hədis deməyin. Mən təkcə bir dəfə eşitdim (ki, Müaviyə Peyğəmbərdən hədis deyir.»(۳

:d) Peyğəmbərin(s) hökmü və Müaviyənin hökmü

İbni Əbdu Rəbbih deyir: «Nəsr ibni Həccac ilə Əbdurrəhman ibni Xalid ibni Vəlid, Müaviyənin hüzurunda Xalid ibni Vəlidin nökəri Abdullah ibni Həccacın kimliyi barəsində mübahisə edirdilər. Mübahisə uzun çəkdiyindən Müaviyə öz katibinə göstəriş verdi ki, bu iki şəxsin işinin həll etmək üçün başqa bir vaxtda məhkəmə iclası .təşkil etsin

Həmin vaxt Məhkəmə başlandı. Müaviyə hakim xələtini əyninə geyinib öz kürsüsündə .əyləşdi və bu iki şəxsə danışmaq üçün izn verdi

Nəsr ibni Həccac dedi: (Abdullah) mənim qardaşım və atamın oğludur... Atam mənə

.onun öz oğlu olduğunu bildirmişdir

Əbdurrəhman dedi: (Abdullah) mənim qulum, atamın qulluqcusunun oğludur. O, !zinadan əmələ gəlmişdir

!Müaviyə dedi: Ey Mə`mur, al bu daşı Nəsr ibni Həccaca ver



---

Rəbiul-əbrar»,c.۴. səh.۲۴» . [۱] -۱

Sünənun-Nəsai»,c. ۵. səh.۲۵۳ ; «Sünənul-Kubra»,c.۷. səh.۲۴۴» . [۲] -۲

Tarixu Mədinəti Dəməşq»,c.۵۹.səh.۱۶۷, İbni İdris deyir: «Eşitdiyimə görə Müaviyə» . [۳] -۳ «.Peyğəmbərdən (s) çox az hədis nəql etmişdir

Nəsr, bu hökm Peyğəmbərin hökmüdür: «Zinadan olmuş övladı kişiyə (zinakar qadının ərinə) verin. Zinakar qadına isə daş verin.»

Nəsr dedi: «Ey Əmirəl-mö`minin, axı sən özün bu hökmü Ziyadın haqqında icra etmədin?!»

Müaviyə dedi: «O Müaviyənin hökmü idi, bu isə Peyğəmbərin hökmü.»(1)

(Yəni, o zaman şəxsi mənafeyim tələb edirdi ki, Peyğəmbərin hökmünün əksinə olaraq öz hökmümü icra edim. Lakin bu məsələdə heç bir mənfəətim olmadığı üçün Peyğəmbərin hökmünü icra etdim.)

e) Şərab içmək:

Əhməd ibni Hənbəl yazır: «..Abdullah ibni Bureydə nəql edir ki, mən atamla birlikdə Müaviyənin yanına gedib xalçasının üstündə əyləşdik. Bizim üçün yemək gətirdilər. Biz o yeməyi yedikdən sonra süfrəyə şərab gəldi. Müaviyə şərabdan içdi. Ondan sonra atam şərab içərək dedi: Peyğəmbər şərabı haram etdiyi gündən bəri şərab içməmişdim...»(2)

**9. Peyğəmbərdən (s) hədis nəql etməmək**

Şə`bi deyir: « İbni Ömərlə düz bir il oturub-durdum. Amma bir dəfə də olsun, onun Peyğəmbərdən hədis nəql etdiyini eşitmədim.»(3)

Müəllif: (Allaha and olsun ki, sələf və səhabənin bə`zisinin Peyğəmbərin (s) hədislərinə e`tinasız yanaşaraq onları camaata nəql etməməkdən, şərabı haram bilərək içməkdən, Məhəmməd Peyğəmbərin (s) sünnəsinin qarşısında yeni hökm və sünnə gətirərək durmaqdan məqsədləri, yalnız şiələrin və ya Həzrət Əlinin (ə) o məsələlərə artıq əhəmiyyət verməsinə xatir olmuşdur. (Necə ki, «təlbiyə» məsələsində oxudunuz.) İndi özünüz mühakimə yürüdün: bunlar (səhabələrin hamısı) Peyğəmbərin (s) sünnəsinə əməl edənlər idilərmi? Bizə vacibdirmi ki, səhabələrə iqtida edək? Bu bizim üçün iftixarmı sayılır?!!

**10. Peyğəmbəri (s) öldürmək üçün məkrli tədbir**

Sihah və Sünənlərdə yazılmış rəvayətlərə əsasən səhabələrdən

səh:۳۷

---

Əl-əqdul-Fərid»,c.۶. səh.۱۳۳» . [۱] -۱

Müsnədu Əhməd»,c.۵. səh.۳۴۷» . [۲] -۲

Əl-mühəddisul-Fazil», səh.۵۵۱; «Mə`əl-Doktor Qəffari», səh.۳۳۵» . [۳] -۳

bir dəstəsi Məhəmməd Peyğəmbəri (s) öldürmək üçün tədbir tökdülər. Hadisə Təbuk döyüşündən qayıqarkən baş vermişdi. Peyğəmbər (s) uca bir təpənin başına çıxdığı vaxt üzlərinə niqab bağlamış səhabələrdən bir neçəsi Peyğəmbərin (s) miniyini çəkən Əmmarın üstünə hücum etdilər. Onlar bu işlə istəyirdilər ki, Peyğəmbərin (s) dəvəsini hürküdərək onu təpənin başından uçuruma yıxıtsınlar və bu işlə öz mənfur niyyətlərinə nail olsunlar. Onların bir məqsədi var idi, Allahın isə başqa bir məqsədi. Sözsüz ki, yalnız Allah Öz məqsədinə yetişir. İndi isə bə`zi rəvayətləri nəzərinizə :çatdırırıq

Əhməd «Müsnə»dində yazır: «Mənə Abdullah rəvayət etdi; bu rəvayəti ona atası . ١ :Yezid, ona da, Vəlid ibni Abdullah ibni Cumeyd və ona da, Əbu Tufeyl nəql etmişdi

Peyğəmbər (s) Təbuk döyüşündən qayıtdıqdan sonra carçıya əmr etdi ki, e`lan edib !belə de: Peyğəmbər (s) təpənin başına çıxır, heç kim ona tərəf yaxınlaşmasın

Əmmar Peyğəmbərin dəvəsini sürür, Hüzeyfə isə onlara yol göstəridı. Bu zaman üzlərinə niqab bağlamış bir dəstə adam öz atlarını Əmmarın üstünə sürdülər. Əmmar miniklərə vurmağa başladı. Peyğəmbər (s) Hüzeyfəyə buyurdu: «Yolunu göstərməyə davam et.» Sonra Peyğəmbər (s) aşağı gəldi. Əmmara yaxınlaşıb buyurdu: – Ey ?Əmmar, onları tanıdın

Atlarının kimlərə məxsus olduqlarını bilirəm. Lakin süvarilər üzlərinə niqab – .bağlamışdılar

!?Peyğəmbər (s) buyurdu: – Heç bilmirsənmi, onlar bu işlə nəyə nail olmaq istəyirdilər

!Allah və Onun Rəsulu daha yaxşı bilər –

Peyğəmbər (s) buyurdu: – Onlar istəyirdilər ki, sənin miniyini hürküdərək Allahın .Rəsulunu təpədən uçuruma salsınlar

Bu zaman Əmmar Peyğəmbərin səhabələrindən olan bir kişi ilə höcətləşməyə başladı, ona dedi: Səni and verirəm Allaha, de görüm, təpənin başına səhabələrdən neçə nəfər ?hücum etdi

.On dörd nəfər –

.Əmmar dedi: – Əgər səni də onlardan hesablasaq, on beş nəfər olurlar

Peyğəmbər (s) on beş nəfərdən üçünü günahsız saydı. Həmin üç səhabə deyirdilər: «Allaha and olsun, biz nə Peyğəmbərin carçısının səsini eşitdik və nə o biri səhabələrin «.məqsədini bilirdik

Əmmar dedi:– Mən şəhadət verirəm ki, qalan on iki səhabə Allah və Onun Rəsulunun (s) dünyada və qiyamətdə düşmənləridir.(١)

٢. Süyuti yazır: «Urvədən nəql olunmuş rəvayətdə deyilir ki, Peyğəmbər (s) Təbuk döyüşündən Mədinəyə qayıdarkən yolunu başqa bir səmtə saldı. Orada səhabələrdən bir neçəsi məkr işlədib Peyğəmbəri (s) yolun başında olan təpədən uçuruma salmaq istədilər.

Peyğəmbər (s) Hüzeyfəyə buyurdu: – Ey Hüzeyfə, o qrupdan heç olmazsa bir nəfəri tanıdınmı?

– Filankəsin və filankəsin miniklərini tanıdım.

Peyğəmbər (s) buyurdu: – Gecə yarısı, üzləri bağlı halda hücum etdilər. Heç bilirsənmi onlar kim idi və məqsədləri nə idi?

– Yox, Allaha and olsun ki, bilmirəm, ey Peyğəmbər.

– Onlar bizimlə gəlməklə istəyirdilər ki, məni təpədən uçuruma atsınlar.

Bu zaman Peyğəmbərin yaxınlığında olan səhabələr dedilər: – Ya Rəsuləllah, niyə əmr etmirsən ki, onların boynunu vuraq?

Peyğəmbər (s) buyurdu: – Xoşum gəlmir ki, camaat «Məhəmməd öz səhabələrini öldürdü.» desinlər.

Sonra Peyğəmbər (s) onların adlarını Əmmar və Hüzeyfəyə söylədi və onlara bərk-bərk tapşırdı ki, söylədiklərimi sirr saxlayın.»(٢)

٣. İbni Kəsir yazır: Əmmar və Hüzeyfə soruşdular: – Ya Rəsuləllah, niyə əmr etmirsən ki, onları öldürək?

Peyğəmbər (s) buyurdu: İstəmirəm ki, camaat «Məhəmməd öz səhabələrini öldürür.»(٣) desinlər.

Əgər söylədiklərimizə diqqət yetirsəniz, görərsiniz ki, Peyğəmbəri (s) öldürmək istəyən

və belə bir böyük günaha,ağır cinayətə cəhd edən terroristlər, elə Peyğəmbəri-Ə`zəmin öz səhabələri olmuşdur. Hətta Peyğəmbərin (s) özü də onları «səhabə» kimi tanıtdırmışdı. Həmçinin, İbni Kəsirdən nəql olunmuş rəvayətdə deyilir: «İstəmirəm ki, .camaat «Məhəmməd öz səhabələrini öldürür.» desin

Müslim öz «Səhih»ində Hüzeyfənin rəvayətinə işarə edir və

səh:٣٩

---

Müsnədi Əhməd»,c.٥. səh.٤٥٣» . [١] -١

Əd-dürrül – Mənsur»,c.٣. səh.٢٥٩» . [٢] -٢

Təfsiru İbni Kəsir»,c. ٢. səh.٣٢٢» . [٣] -٣

deyir ki, Peyğəmbərin (s) səhabələrinin arasında münafiqlər var idi. Sonra o, həmin .hadisəni xatırladır

Səhihu Müslim»də yazılmışdır: Hüzeyfədən nəql olunur ki, Peyğəmbər (s) buyurdu:» .۴ «Mənim səhabələrimin arasında on iki nəfər münafiq var ki, onlardan səkkiz nəfəri (dəvə iynənin deşiyindən keçmədiyi kimi, heç vaxt behiştə daxil olmayacaqlar.»(۱

### ?SUİ–QƏSD HAZIRLAYAN KİMLƏR İDİ

İbni Həzm öz kitabında Vəlid ibni Cumeydən nəql olunmuş rəvayətə istinad edərək Peyğəmbərə (s) sui-qəsd etmək istəyən on iki səhabədən beşinin adını çəkmişdir. Lakin elə həmin yerdə Vəlidi etibarsız sanıb, onun rəvayətini rədd edərək yazır: «Vəlid bədbəxt bir adamdır Mən onu hədis nəql etməyə layiq bilmirəm. O, rəvayət edir ki, «filankəs və ..., və Sə`d ibni Əbi Vəqqas Peyğəmbəri (s) öldürmək üçün belə qərara gəlirlər ki, onu «Təbuk» döyüşəndən qayıdarkən təpədən uçuruma salsınlar». Bu rəvayət yalan və saxtadır. Allah bu qondarma rəvayəti düzəldənə lə`nət etsin! Biz heç vaxt belə bir rəvayətə etimad etmirik.(۲)(Kitabin əslində bütün adlar yazılmışdır, biz (onları burada gətirmədik.-Mütərcim

### !İBNİ HƏZMƏ ETİRAZ

Birinci etiraz: Peyğəmbərə sui-qəsd etmək üçün səhabələr tərəfindən icra olunmuş proqramı inkar edə bilmərik. Çünki, bu hadisəni on ikidən artıq səhabə nəql etmiş, Peyğəmbər (s) də ona xəyanət etmək istəyənlərin adını söyləmiş və Hüzeyfə də onları çox dəqiq şəkildə tanımışdı. Elə buna görə də səhabələrdən bə`zisi Hüzeyfədən soruşurdular ki, Peyğəmbər (s)onların adını bu proqramın iştirakçıları arasında (münafiq və



---

Səhihi Müslim»,c.۸. səh.۱۲۲. Ümumiyyətlə, bir çox müəlliflər öz kitablarında» . [۱] -۱ səhabələrin Peyğəmbəri (s) öldürməyə cəhd etdikləri kimi, bir-birlərini də öldürmək məqsədilə tədbirə əl atmaqlarını qeyd etmişlər. Baxmayaraq ki, bə`zən bu tədbirləri həyata keçirməmişlər. Necə ki, Səmani Həzrət Əlini (ə) öldürmək üçün çəkilmiş tədbirə

belə işarə edir: «... Kufə şəhərində Şərif Ömər ibni İbrahim Hüseynidən soruşdum ki, Əbu Bəkrin «Xalid mə`mur olduğu işi yerinə yetirmədi» cümləsindən məqsədi nədir? O, belə cavab verdi: Əbu Bəkr, Xalid ibni Vəlidi məmur etmişdi ki, Əlini (ə) öldürsün. Sonra (isə peşman olub öz əmrini geri götürdü. (Əl-ənsab, ۳. ۹۵

Əl-Mühəlla»,c.۱۱. səh.۲۲۴» . [۲] -۲

terrorist simasında) çəkmişdirmi? Necə ki, Şeyx Zəhəbi bu məsələni ikinci xəlifə Ömər ibni Xəttaba aid etmişdir. O yazır: «Hüzeyfə Peyğəmbərin (s) layiqli səhabələrindən biri idi və Peyğəmbərə sui-qəsd etmək istəyənləri tanıyırdı. Həzrət Peyğəmbərin (s) özü o münafiqlərin adını Hüzeyfəyə bir sirr olaraq söylədi. Bu iş qiyamət gününə qədər sirr qalaraq, fitnənin qarşısı alındı. Filankəs Hüzeyfədən «səni Allaha and verirəm de görüm mən münafiqlərdənəm?» deyə soruşanda Hüzeyfə cavab verdi: «Yox, mən səndən (.sonra pak adam tanımıram.»(١) (Hüzeyfə sirri qorudu

İkinci e`tiraz: Bu rəvayəti nəql edən Vəlid ibni Cumeyin etibarlı olması barədə heç kimin şübhəsi yoxdur. Bu məsələyə aşağıda qeyd edilən «Rical» alimləri(٢) öz fikirlərini :açıq-aydın şəkildə bildiriblər

.İcli, Vəlid ibni Cumeyin etimadlı şəxs olmasını açıq şəkildə bəyan etmişdir .١

İbni Sə`ddən nəql olunur: «O, etibarlı şəxsdir və onun vasitəsilə bir çox hədislər .٢ «.bəyan olunmuşdur

.İbni Həbban onun adını etibarlı şəxslərin sırasında gətirmişdir .٣

«.Əhməd ibni Hənbəldən nəql olunur: «Onun heç bir eybi yoxdur .۴

«.Yəhya ibni Muindən nəql olunur: «O, etibarlı şəxsdir .۵

«.Əbu Hatəmdən nəql olunur: «Vəlid ibni Cumey əməli-saleh olmuşdur .۶

(Əbu Zurrədən nəql olunur: «Onun heç bir iradı yoxdur.»(٣ .٧

«.Zəhəbidən nəql olunur: «Əbu Nəim, Vəlid ibni Cumeyi e`tibarlı sanmışdır .٨

Deməli, Vəlid ibni Cumeyin e`tibarlı şəxs olması sübut olundu, buna əsasən də onun zikr etdiyi rəvayət mö`təbər sayılır(۴). Lakin biz Vəlidin rəvayətində söylənilən adlara israr etmirik. Çünki, İbni Quteybə bu rəvayətin əslini söyləyib, amma səhabələrin adlarını başqa rəvayətlərdən fərqli olaraq zikr etmişdir: « Təbuk döyüşündə Peyğəmbəri (s) təpədən uçuruma salmaq istəyənlər bunlar idi: Abdullah ibni Ubəy, Sə`d ibni Əbi

---

Tarixul-İslam» (Əl-xüləfa), səh.۴۹۴; «Əl-bidayə vən-nihayə»,c.۵. səh.۲۵» . [۱] -۱

Rical alimləri – rəvayət söyləyənlərin kimliyi, şəxsiyyəti, etimadlı olub-olmamsı . [۲] -۲
.haqda nəzər verən tədqiqatçılardır

Əs-siqat», səh.۴۶۵» . [۳] -۳

Əl-məarif»,səh.۳۴۳» . [۴] -۴

Sərəh, Əbi Hazir Ə`rabi, Cəllas ibni Suveyd ibni Samit, Mucəmmə ibni Harisə, Məlih Teymi, Hüseyn ibni Numeyr, Tuimət ibni Ubeyriq, Murrət ibni Rəbi və bu dəstənin «.başçısı Əbu Amir

Müəllif:) İbni Quteybənin söylədiyi rəvayətin sənədi yoxdur və bu rəvayətin kim) tərəfindən deyilməsi mə`lum deyil. Bizim məqsədimiz isə budur ki, səhabə və sələfin arasında olan münafiqləri tanıyaq. Bütün səhabələri istisnasız olaraq – təmizə .çıxarmağın heç bir mə`nası yoxdur

Əllamə Məqbili deyir: «Səhabələrin arasında ədalətli şəxslər çox olsa da, hamılıqla ədalətli olmamışdır. Onlar da başqa insanlar kimi unuda, səhv edə və nəfsani .istəklərinə itaət edə bilərlər. Necə ki, onlardan bir çoxu mürtəd oldular

Peyğəmbər (s) «vida» həccində buyurdu: «Məndən sonra yenidən kafirliyə qayıtmayın (ki, bir-birinizlə vuruşasız».(١)



---

Əl-əzva ələl-hədis», səh.۲۹۸; Taha Hüseyn, «Əl-fitnətul-kubra», səh.۱۷۰; » . [۱] -۱ Nəsirəddin Əlbani, «Silsilətul-əhadisuz-zə`ifə vəl-mövzuə»,c.۱. səh.۸۲ ; Şəkvani, «İrşadul-fuhul», səh.۱۵۸; Əbu Rəyyə, «Əl-əzva», səh.۳۵۳ ; Rafei, «Əl-e`caz», səh.۱۴۱

## ƏBU BƏKRİN XİLAFƏTİNƏ AİD DƏLİLLƏRİN MƏNTİQİ OLMAMASI .۴

### QEYRİ–QANUNİ XİLAFƏT

?Sual: Əhli-sünnənin Əbu Bəkrin xilafətinin şər`i (qanuni) olmasına dəlilləri nədir

Cavab: Əhli-sünnə Əbu Bəkrin xilafətinin qanuni və şə`ri olmasını sübut etmək üçün iki :mühüm dəlilə istinad edirlər

Əbu Bəkrin xilafətinə icma vardır (Müsəlmanların mühüm şəxsiyyətləri(۱) rə`y . ۱ .(veriblər

Əbu Bəkrin başqalarından üstün olmasına dair on dəlil vardır.Belə olan halda təbiidir .۲ .ki, imamət də üstün şəxsə yetişməlidir

### İCMA

Əhli-sünnənin alim və ustadlarının kəlamlarından özünüz başa düşəcəksiniz ki, əslində Əbu Bəkrin xilafətinə heç bir icma nəzər verməmişdir və onlar xilafətin şər`i olması üçün icmanı zəruri bilmirlər. Onların nəzərincə, əgər müsəlmanlardan bir nəfər hansısa bir kişi ilə beyət bağlasa o şəxs xəlifə olur və belə bir şəxsin xilafəti şər`i .cəhətdən məqbul sayılır

Mavərdi Şafei (۴۵۰. h. q. vəfat) deyir: «Bə`zilərinin .۱

səh:۴۳

---

Fəxr Razi icmanın olmasını belə iddia edir: «Allah, ən yaxşı ümmət kimi mədh . [۱] -۱ olunan bu ümməti müvəfəq etsin! Çünki bu ümmət Peyğəmbərdən (s) sonra öz imamı Əbu Bəkri icma vasitəsilə tə`yin etdi.» «Ət-Təfsirul-kəbir»,c.۱۶. səh.۶۸

fikrincə, əgər müsəlmanlar hər hansı bir şəxs ilə beyət etsələr o şəxs şəriət baxımından xəlifə sayılır. Lakin bu fikir Əbu Bəkrin xilafətə yetişməyi ilə ziddir. Çünki, o, xilafətə yetişmək üçün yalnız öz ətrafındakıları ilə beyət etdi və başqa şəhərlərin (böyük şəxsiyyətlərinin bu məsələyə fikri mə`lum olmadı.»(۱

Qurtəbi (۶۷۱ h. q. vəfat) yazır: «Əgər müsəlmanların böyük şəxsiyyətlərindən bir nəfər .۲ bir şəxsin xəlifə olmasına beyət etsə, o şəxsin xilafəti sabit olur. Əlbəttə, bə`ziləri bu nəzəri qəbul etmirlər. Lakin bizim bu məsələyə dəlilimiz Ömərin Əbu Bəkrlə «.(beyətidir(۲) (və bu beyətlə Əbu Bəkrin xilafəti şəriət baxımından sabit oldu

Qəzzali (۴۷۸ h. q. vəfat) yazır: «Xilafətdə icma şərt deyildir; hətta ümmət bir nəfər .۳ tərəfindən seçilmiş xəlifə ilə beyət etməsələr də, onun imaməti düzgün sayılır. Bu məsələyə dəlilimiz budur ki, Əbu Bəkr (Ömərin vasitəsilə) xilafət kürsüsündə əyləşəndə səhabələrdən bir çoxu bu məsələdən xəbərsiz idi. Bununla belə, heç kim onun xilafətini inkar etmədi. Deməli, əgər xilafətdə icma şərt deyildirsə, bir şəxsin xəlifə olması üçün neçə nəfərin onunla beyət edəcəyi də deyilməmişdir. Beləliklə, müsəlmanların böyük şəxsiyyətlərindən hətta bir nəfər, bir şəxsin xilafətə yetişməsinə (beyət edərsə o şəxs xəlifə sayılır.»(۳

İbni Ərəbi Maliki (۵۴۳ h. q. vəfat) yazır: «Bir şəxsin xəlifə olması üçün lazım deyil ki, .۴ (hamı onunla beyət etsin; bu məsələ üçün iki, hətta bir nəfər də kifayət edər.»(۴

Lahici (۷۵۶ h. q. vəfat) yazır: «Əgər bir şəxsin xilafəti öz ixtiyarı və başqa bir nəfərin .۵ beyəti ilə həyata keçərsə, artıq icmaya heç bir ehtiyac qalmayacaqdır. Çünki, icmanın zərurəti üçün əqli və nəqli dəlilimiz yoxdur. Əksinə, dəlillərimiz bir şəxsin xilafəti üçün bir və ya iki nəfər böyük şəxsiyyətin beyətinin kifayt etməsini sübuta yetirirlər. Necə ki, səhabələr dinə möhkəm bağlı olsalar da xilafətdə bir nəfərin beyətini kifayət bilirdilər. Ömərin Əbu Bəkrlə və Əbdürrəhman ibni Ovfun Osman ilə beyəti, söylədiklərimizin (aydın şahididir.»(۵

Yuxarıdakı mətləbləri oxuyun və görün ki, Əbu Bəkrin

səh:۴۴

١- [١] . Razılıq əlaməti olaraq əlini o birisinin əlinə qoymaq.

٢- [٢] . «Əl-əhkamus-Sultaniyyə», səh.٣٣.

٣- [٣] . «Cameu əhkamil-Qur`an»,c.١. səh.٢۶٩.

۴- [۴] . «Əl-irşad fil-əhkam», səh.۴٢٢.

۵- [۵] . «Əl-məvaqif fi elmil–kəlam», c.٨. səh.٣۵١.

xəlifə olmasına səhabələr nəzər verdimi? Yoxsa xilafət Ömər ibni Xəttabın bu məsələyə israr etməsi və müxalifləri qorxutması ilə Əbu Bəkrə nəsib oldu?!! İbni Əbil-Hədid bu haqda yazır: «Ömər, Əbu Bəkrin xilafətə yetişməsinə israr edərək müxalifləri əzdi. Zübeyr onun xilafətinə qarşı çıxıb qılıncını qından çıxartdıqda onun qılıncını əlindən alıb sındırdı. Miqdadın müxalifət etdiyinə görə sinəsinə vurdu. Həmçinin, Sə`d ibni Übadəni «Səqifə» də tapdaladı və əmr etdi: «Sə`di öldürün, Allah onu öldürsün!» Hübab ibni Munzirin burnunu sındırdı... Fatimənin (s) evinə girən Haşimiləri qorxudub oradan çıxartdı (və onları Əbu Bəkrlə beyətə məcbur etdi.) Əgər Ömər olmasaydı, Əbu (Bəkr heç vaxt xilafətə yetişə bilməzdi.»(١

Sünni alimlərinin öz etiraflarını eşitdikdən sonra mə`lum oldu ki, Əbu Bəkrin xilafətə yetişməsində icmanın heç bir rolu olmayıbdır. Əksinə, yalnız bir şəxsin (Ömərin) israr etməklə digərlərini qorxudub, burnunu sındırıb, və ayaq altına salması nəticəsində .Əbu Bəkr hakimiyyətə gəldi

Zəhəbi yazır: «Əbu Hamid «Sirrul-aləməyn və kəşfu ma fid-darəyn» kitabında Peyğəmbərin(s) buyurduğu «(Mən kimin rəhbəriyəmsə, Əli də onun rəhbəridir)» hədisinin şərhində yazır: Ömər üzünü Əliyə tutub dedi: «Mübarək olsun! Mübarək olsun! «...Bu gün sən hər bir mö`min və mö`minənin imamı oldun

Əbu Hamid yazır: «Bu təbrik Ömərin, Əlinin (ə) xilafətinə beyət və razılıq etməsidir. Lakin sonralar nəfsani istəkləri və hakimiyyətə olan məhəbbəti onu aldatdı.O, Xilafət kürsüsündə oturub əmr sahibi olmaq və dövlət qanunu tənzimləmək arzusuna düşdü, camaatı Əli (ə) ilə müxalifətə səslədi. Nəhayət, öz istəyinə çatıb Əlini (ə) tərk etdi və «!onu çox ucuz qiymətə satdı. Doğrudan da Ömər çox pis iş gördü

Zəhəbi yazır: «Qəzzali şiələrin dediyi bu cür mə`nasız sözlərdən çox demişdir. Axı mən bilmirəm: onun belə danışmasına nə bais olubdur?! Lakin elə bil ki, o sonralar öz batil (fikrindən dönüb haqqa tərəf qayıtmışdır. Doğrudan da, Qəzzali elm dəryası idi...»(٢

## ÜSTÜNLÜK

Əhli-sünnənin Əbu Bəkrin xilafətinin düzgün və qanuni

.olmasına dair gətirdikləri ikinci dəlil onun başqa səhabələrdən üstün olması iddiasıdır

Şərhül-məvaqif»in müəllifi yazır: «Bizim və qədim mö`təzilə alimlərinin fikrincə» Peyğəmbərdən (s) sonra camaatın ən üstünü Əbu Bəkrdir. Şiələrin və son əsrdə (mötəzilə alimlərinin fikrincə isə, Peyğəmbərdən (s) sonra camaatın ən üstünü Əlidir.»(١

Əbu Bəkrin başqa səhabələrdən üstün olmasını sübut etmək üçün on dəlilə istinad :etmişlər

.Birinci dəlil: Əbu Bəkr insanların ən pərhizkarı, təqvalısıdır

Qur`ani-kərim onun haqqında buyurur: «Camaatın ən pərhizkarı cəhənnəm odundan uzaq qalacaqdır. Belə bir şəxs öz malını təmizə çıxartmaq üçün ondan (bir qismini Allah (yolunda) əta edir...» (Ləyl, ١٧, ١٨

Şərhul-məvaqif»in müəllifi yazır: «Təfsirçilərin çoxu və alimlər bu ayənin Əbu Bəkrin» barəsində nazil olmasını bildirmişlər. Beləliklə o, insanların ən pərhizkarıdır və Qur`ani-kərimin buyurduğuna əsasən, «İnsanların ən pərhizkarı Allahın yanında ən .əzizdir.» (Hücərat, ١٣) Deməli, Əbu Bəkr Allahın yanında ən əziz və üstün insandır

:Cavab

Şərhul-məvaqif»in müəllifinin dedikləri, sadəcə olaraq dəlil-sübutsuz bir iddiadır.)») .١ Əslində bu ayə Əbüldəhdah və xurma ağacının sahibi barəsində nazil olmuşdur.(٢) Hətta bə`zi təfsirçilərin nəzərincə, yuxarıda söylədiyimiz ayələr ümumi mö`minlərin .haqqında nazil olmuşdur və hansısa xüsusi bir mö`minə aid deyildir

Ləyl» surəsinin ١٧-١٨-ci ayələrinin Əbu Bəkr haqqında nazil olub-olmamasını» .٢ dəqiqləşdirmək üçün bu məsələnin nəql olunduğu hədisin sənədini araşdırmaq lazımdır. Heysəmi bu hədisin etibarsız olması haqqında belə söyləyir: «Hədisin (ravilərinin arasında Müs`əb ibni Sabit vardır və o, etimadlı şəxs deyildi.»(٣

Bundan əlavə, Müs`əb, Abdullah ibni Zübeyrin nəvəsidir və Əbu Bəkrin qızı Əsma, Abdullahın gəlini olmuşdur. Bu minvalla Əbu Bəkr, Müs`əbin babasıdır. Müs`əb (hədis

qondarmaqla) təbiidir ki, ana tərəfindən olan babası ilə fəxr etmək istəyir. Həmçinin, onun Peyğəmbərin (s) Əhli-beytindən (ə) uzaq gəzməsi də məşhur bir hadisədir. Bir çoxları, o cümlədən Əhməd ibni Hənbəl, Yəhya ibni Muin Müs`əbi etibarsız və ədalətsiz adam biliblər. Əbu Hatəmdən belə nəql olunur: «Heç bir məsələdə ona istinad olunmamalıdır.» Həmçinin Nəsaidən nəql olunur: «O, (Müs`əb ibni Sabit) etimadlı şəxs «.deyildi

Aişə (Əbu Bəkrin qızı), onların tə`rifində bir ayə də olsun belə, nazil olmamasını etiraf .٣ edərək deyir: «Allah Qur`anda bizim tə`rifimizdə bir ayə də olsun belə, nazil (etməmişdir.»(١

İkinci dəlil: Peyğəmbərdən belə rəvayət edirlər: «Məndən sonra Əbu Bəkr və Ömərə (itaət edin!»(٢

Əhli-sünnə alimləri bu hədisi belə açıqlayırlar: «İtaət edin» felin əmr formasıdır ki, bütün müsəlmanlara, həmçinin Əliyə xitab olunur. Deməli, Əliyə vacibdir ki, bu iki şeyxə itaət «.etsin

Bəlkə də bu hədis əhli-sünnə alimlərinin öz əqidələrini sübuta yetirmək üçün ən mühüm və əsaslı dəlillərindən sayılır. Elə buna əsasən deyirlər: bu iki şeyxin bütün işləri .bizə höccətdir (dəlil və örnəkdir). Lakin bizim bu söylənilənlərə tutarlı cavabımız vardır

:Cavab

Hədisin sənədi mötəbər deyil, necə ki, bir çox sünnü alimləri də bu məsələyə etiraf .١ :etmişlər. O cümlədən

.Mənavi «Əl-cameus-səğir»ə yazdığı şərhdə(٣) bu məsələni etiraf etmişdir –

(Əbu Hatəm bu hədisin mötəbər olmadığını söyləmişdir.(٤ –

(Bəzzaz və İbni Həzm yazır: «Bu hədis səhih deyil.»(٥ –

(Əqili deyir: «Mən bu hədisi, sənədi olmadığı üçün qəbul etmirəm.»(٦ –

Termizi, bu hədisi Süfyandan nəql etdikdən sonra söyləyir: «Süfyan ibni Uyeynə bu –

hədisi rəvayət edərkən bə`zən ravilərin arasında Zaidətin adını çəkmiş və onun da Əbdül

səh:۴۷

---

-۱ [۱] . «Buxari»,c.۶. səh.۴۲ «Darul-fikir»

-۲ [۲] . «Müsnədi Əhməd»,c.۵. səh.۳۸۲ ; «Sünəni Termizi»,c.۵. səh.۵۷۲ ; «Müstədrəkul-Hakim»,c.۳. səh.۷۵

-۳ [۳] . «Feyzul-Qədir»,c.۲. səh.۵۶

-۴ [۴] . Əvvəlki ünvan

-۵ [۵] . Əvvəlki ünvan

-۶ [۶] . «Əz-züəfa»,c.۴. səh.۹۵

Məlik ibni Umeyrdən nəql etdiyini söyləmiş, bə`zən isə Zaidətin adını çəkməməklə hədisi tərəddüddə saxlamışdır.»(۱)

– Zəhəbi, Əbu Bəkr Nəqqaşdan nəql edir: «Bu hədisin əsası, kökü yoxdur.»(۲)

– Dar Qutni yazır: «Bu hədis, ravilərinin arasında İmrani adlı ədalətsiz bir şəxs olduğu üçün, etibarsız sayılır.»(۳)

– Ərcani (۷۴۳ h. q. vəfat) Beyzavinin «Əl-minhac» kitabına yazdığı şərhdə deyir: «Bu hədis qondarmadır (saxtadır).»(۴)

– Zəhəbi yazır: «Bu hədisin sənədi ciddi şəkildə etibarsızdır.»(۵)

– İbni Həcərdən nəql olunur: «Bu hədisin əsassız olmasına israr olunmuşdur.»(۶)

– Heysəmi deyir: «Bu hədisin ravilərinin arasında bə`zi şəxslər vardır ki, heç mən özüm də onları tanımıram... Bu hədisin ravilərinin arasında Yəhya ibni Əbdülhəmid Hamani vardır ki, etimadlı şəxs deyildir.»(۷)

– Şeyxül-İslam Hərəvidən nəql olunur: «Bu hədis saxtadır.»(۸)

– Həmçinin, İbni Dərdiş bu hədisin əsassız və batil olması haqda bir çox nəzərlər söyləmişdir.

۲. Səhabələr dəfələrlə sözləri və əməlləri ilə bu iki şeyxə qarşı çıxmışlar. Onda deməli, səhabələr fasiqdirlər?!

۳. Bu iki şeyxin dəflərlə öz aralarında da dəfələrlə ixtilafları olmuşdur. Belə bir vaxt müsəlmanlar onların hansı birinə təqlid etməli idilər?

İndi isə, bu iki nəfərin arasında olan ixtilaflardan bə`zi nümunələri nəzərinizə çatdırırıq:

Ömər, Əbu Bəkrin xəlifə olduğu vaxt onun hökmlərinə etiraz edirdi:

Uyeynə ibni Həsin və Əqrə ibni Habis, Əbu Bəkrin yanına gəlib dedilər: «Ey Peyğəmbərin canişini! Bizim yaxınlığımızda

səh:۴۸

---

Əl-cameus-səhih»,c.۵. səh.۶۷» . [۱] -۱

Mizanul-etidal»,c.۱. səh.۱۴۲» . [۲] -۲

Lisanul-mizan»,c.۵. səh.۲۳۷» . [۳] -۳

Mühazirat fil-etiqadat»,c.۱. səh.۳۴۵» . [۴] -۴

Təlxisul-Müstədrək»,c.۳. səh.۷۵» . [۵] -۵

Lisanul-mizan»,c.۱. səh.۱۸۸, ۲۷۲ və cild ۵. səh.۲۳۷» . [۶] -۶

Məcməuz-zəvaid»,c.۹. səh.۵۳, ۲۹۵» . [۷] -۷

Əd-dürrun-nəzid min məcmuətul-həfid», səh.۹۷; «Əsnəl-Mətalib fi əhadis»...» . [۸] -۸ səh.۴۸

şoranlıq bir yer vardır ki, heç bir xeyri-mənfəəti yoxdur. Əgər sən məsləhət bilirsənsə o yeri bizim ixtiyarımızda qoy. Bəlkə biz orada bir şey əkib-becərə bildik və Allah bizə .kömək oldu

Əbu Bəkr həmin yeri onlara verib bu haqda bir müqavilə imzaladı. Bu məsələ üçün şahid də tutdu. Onlar əllərindəki müqaviləni Ömərə göstərmək üçün onun yanına getdilər. Müqaviləni Ömərə oxuduqları zaman, Ömər kağızı onların əlindən alıb ağız suyu kağızın üstünə atdı. Onlar Ömərə nalayiq sözlər dedilər. Ömər dedi: Peyğəmbər (s) sizlərə yaxşılıq etdiyi zaman İslam dini hələ hər tərəfə yayılmamışdı. Allah İslam dinini (yaymaqla) sizi əziz etdi. Əlinizdən nə gəlirsə gedib edin! Mən Allaha xatir də olsa (belə, sizi nəzərə almayacağam, Hətta siz Allaha xatir iş görsənizdə!»(١)

Mənə elə gəlir ki, Peyğəmbərin zamanından bəri bunların arasında həmişə ixtilaf olmuşdur. İndi isə onların arasında düşən ixtilafdan başqa bir nümunəni nəzərinizə :çatdırıq

İbni Müleynədən nəql olunur: «İki nümayəndə Əbu Bəkr və Ömərin həlak olmalarına səbəb ola bilərdilər. Çünki, Bəni-Təmim tayfasından bir qrup (İslam dinini qəbul etmək üçün) Peyğəmbərin hüzuruna gələrkən, Əbu Bəkr, Əqrə ibni Habis Hənzəlinin Bəni-Təmim tayfasından nümayəndə seçilməsini təklif etdi. Lakin Ömər başqa bir nəfərin .nümayəndəliyini irəli sürdü

!Əbu Bəkr Ömərə dedi: – Sən bilə-bilə mənimlə müxalifətçilik etdin

?Ömər dedi: – Hansı səbəbə mən səninlə müxalifətçilik etməliyəm

İş o yerə gəldi ki, bunlar Peyğəmbərin hüzurunda çığırıb-bağırmağa başladılar. Bu zaman ayə nazil oldu: «Ey müsəlmanlar, Peyğəmbərin hüzurunda uca səslə (danışmayın...» (Hücərat, ١)(٢)

Həmçinin, İbni Əbil-Hədidin yazdığına əsasən, bir gün Ömər, Əbu Musa Əş`əri və Muğəyrət ibni Şöbə ilə camaatın ən paxılı haqda mübahisə edirdilər. Ömərin nəzəri bu (oldu ki, insanların ən paxılı Əbu Bəkrdir.(٣)

.Deyilənlərin hamısı bu iki nəfərin arasında olan ciddi münaqişədən xəbər verir

---

Əd-dürrül-mənsur»,c.۳. səh.۲۵۲» . [۱] -۱

Buxari»,c.۳. səh.۱۹۱ (Hücərat surəsinin təfsiri); «Müsnədu Əhməd»,c.۴. səh.۶» . [۲] -۲

Şərhu İbni Əbil-Hədid»,c. ۲. səh.۳۰ » . [۳] -۳

۴. Amədidən nəql olunur: «Peyğəmbərə (s) mənsub edilən hədisin «itaət edin» hissəsində irad vardır. Necə? Əgər belədirsə, onda Əbu Bəkr və Ömərin icması başqa səhabələr üçün dəlil və sənəd olmalıdır. Halbuki, səhabələr heç vaxt bu hökmü qəbul etməyiblər.»(۱) (Deməli, bu hədis saxtadır.)

۵. Əgər bu hədis doğrudan da səhih olarsa onda Əbu Bəkr və Ömərin xilafətinin Peyğəmbərin (s) əmrilə tə`yin olunması sübuta yetir. Belə bir vaxt Peyğəmbərdən sonra səhabələr heç vaxt xəlifənin kim olmasında ixtilaf etməməlidilər.(۲)

Lakin onların aralarına ikitirəlik düşdü. Bir dəstə Əlinin (ə), digər dəstə isə Əbu Bəkrin xəlifə olmasını istəyirdi. Ənsar (mədinəlilər) deyirdi: «Bir nəfər bizdən, bir nəfər də sizdən (Qüreyşdən) xəlifə olsun.» Əbu Bəkr özünü Peyğəmbərin (s) qövmü və yerlisi kimi tanıtdıraraq Ənsarın qabağında durur və belə deyirdi: «Peyğəmbər (s) sizə və başqalarına bizə (Qüreyş tayfasına) bütün işlərdə itaət etməyi əmr etmişdir. Sizə rəva deyil ki, Peyğəmbərlə müxalifət edəsiniz!»

۶. Əbu Bəkrlə Ömərin arasında baş verən bir çox ixtilaflar aydın oldu və onların bə`zisinə işarə etdik. Sizin nəzərinizcə, Peyğəmbər (s) Əbu Bəkr və Ömərin arasında olan ixtilafları və bə`zən də ciddi təzadları gördükdən sonra onlara (eyni zamanda) itaət etməyə əmr edərdimi?! Təbiidir ki, Peyğəmbər (s) heç vaxt bu işi görməzdi!

۷. Peyğəmbərin (s) buyurduğu hədis təhrif olunubdur. Bəlkə də Peyğəmbər (s) həmin hədisdə belə buyurmuşdur: «Ey Əbu Bəkr və Ömər! Məndən sonra iki şeyə (Qur`an və Əhli-beytə) itaət edin!» Yə`ni Əbu Bəkrlə Ömər, Peyğəmbərdən (s) sonra Qur`an və Əhli-beytə (ə) itaət etməyə mə`mur olunmuşdular. Necə ki, hamının qəbul etdiyi məşhur hədisdə Peyğəmbər (s) buyurur: «Mən sizin aranızda iki ağır və qiymətli şeyi əmanət qoyuram: Allahın kitabı və mənim Əhli-beytim.»(۳)

Şeyx Səduq buyurur: «Səhabələrdən heç biri eşitməyiblər



---

۱- [۱]. «Əl-əhkam», c.۱, səh.۲۳۴.

۲- [۲]. Həzrət Əli (ə) Əbu Bəkrlə beyət etmədi. «Əliyə (ə) dedilər ki, beyət üçün əlini

uzatsın. O isə imtina etdi. Əlinin (ə) əlini məcbur açmaq istədikdə o, barmaqlarını sıxdı. Onun barmaqlarını açmaq üçün çox çalışsalar da istəklərinə nail ola bilmədilər. Əbu Bəkr məcbur qalıb öz əlini Əlinin (ə) bükülmüş barmaqlarının üzərinə çəkdi.» «İsbatul-vəsiyyə», səh.۱۴۵ ; «Əş-şafi»,c.۳. səh.۲۶

Termizi, «əl-camius-səhih»,c.۵. səh.۶۰۹; «Əl-səvaiqul-muhriqə», səh.۹۹ . [۳] -۳

ki, Peyğəmbər (s) özündən sonra Əbu Bəkr və Ömərə itaəti əmr etsin. Deməli, əgər bu rəvayət səhihdirsə, mə`nası belə olacaqdır: «Ey Əbu Bəkr və Ömər! Məndən sonra (Qur`an və Əhli-beytə itaət edin.»(١)

Üçüncü dəlil: Peyğəmbər (s) Əbu Dərdaya buyurur: «Allaha and olsun! Nəbi və Mürsəl peyğəmbərlərdən sonra günəşin doğmasını və qürubunu görən elə bir şəxs olmayıbdır «.ki, Əbu Bəkrdən üstün olsun

:Cavab

Təbəraninin «Əsvət» kitabında söylədiyi bu rəvayətin sənədi etibarsızdır. Çünki onun ravilərindən biri İsmayıl ibni Yəhya Təmilidir ki, çox yalançı şəxs olmuşdur. Həmçinin bu rəvayətin başqa sənədindəki ravilərindən biri Bəqiyət ibni Vəliddir. Bu şəxs də (saxtakar və nadürüst omuşdur.(٢)

Dördüncü dəlil: Peyğəmbər (s) Əbu Bəkr və Ömərin haqqında buyurur: «Onlar «.cənnətdə nəbi və mürsəl peyğəmbərlərdən başqa, bütün qocaların ağalarıdır

Sünnilər deyirlər: Əbu Bəkr və Ömər (cənnətdə) müəyyən bir qövmün başçısı olduqları üçün, (dünyada da) onların rəhbərləri olmalıdır. Beləliklə, Əli də bu iki şeyxə itaət .edənlərdən biri olmalıdır

:Cavab

Bu hədisi Bəzzaz və Təbərani, Əbu Səiddən nəql etmişlər. Bu nəqlin ravilərindən biri .١ .Əli ibni Abisdir ki, Heysəminin nəzərincə o, etimadlı şəxs deyildir

Heysəmi bu hədisin ravilərini başqa nəql ilə belə bəyan edir: Bu hədisi mən, Bəzzazdan, Bəzzaz, Ubeydullah ibni Ömərdən və o da, Əbdür-rəhman ibni Məlikdən (nəql edir. Əbdür-rəhman ibni Məlikin düzgün adam olmasını heç kim qəbul etmir.(٣)

-Bu hədisin Peyğəmbər (s) tərəfindən deyilməsi qeyri .٢



Səlatul-təravih», səh.٥٨. Həmçinin ibni Həcərdən nəql olunur: «Bu hədisin» . [١] -١

Malikdən nəql olunmasına əsas yoxdur. Əksinə, bu hədisin Hüzeyfət ibni Yəmandan nəql olunması daha məşhurdur. Dar Qutni bu haqda yazır: Əmri Malik çox pisləyir, habelə İbni Muin də onu rədd edir...» «Lisanul-mizan», c.۵. səh.۲۳۷ Ebri, Beyzavinin «Şərhu minhacil-usul» kitabının «icma» fəslində yazır: «Məndən sonra Əbu Bəkr və Ömərə itaət edin!... hədisi saxtadır.» «Ər-rəvaşihus-səmaviyyə», səh.۱۹۴

Məcməuz-zəvaid»,c.۹. səh.۴۴» . [۲] -۲

Məcməuz-zəvaid»,c.۹. səh.۵۳» . [۳] -۳

mümkündür. Çünki (Peyğəmbərin (s) öz buyurduğuna əsasən) cənnət əhlinin hamısı cavan olacaq və orada bir nəfər də olsun, qoca adam olmayacaqdır. (Allah-taala cənnətə girənlərin hamısını, qoca olsalar da belə, cavanlaşdıracaqdır.) Bu hədisi Bəni-Üməyyə Peyğəmbərin (s) buyurduğu «Həsən və Hüseyn cənnət cavanlarının .ağalarıdır.»(۱) hədisilə rəqabət etmək üçün yalandan Peyğəmbərə (s) nisbət vermişlər

Beşinci dəlil: Peyğəmbər (s) buyurur: «Əgər bir dəstə adamın içində Əbu Bəkr olsa, «.başqalarına layiq deyil ki, ondan qabağa düşsünlər

:Cavab

İbni Covzi bu hədisi saxta hədislərin sırasında gətirərək yazır: «Bu hədis, Peyğəmbərə «.(s) nisbət verilmiş saxta hədisdir

Altıncı dəlil: Peyğəmbər (s) ibadətlərin ən üstünü olan namazda Əbu Bəkri pişnamaz etmişdir. Təbiidir ki, bir şəxs Peyğəmbərin öz əmri ilə onun yerində qalıb pişnamaz .durursa, o şəxs Peyğəmbərdən sonra xilafətə daha layiqdir

Əhməd ibni Hənbəl bu haqda buyurur: «Peyğəmbər (s) Əbu Bəkri namazda imam camaat qərar verib başqa qiraətçilərdən qabağa salmaqla səhabələrə başa saldı ki, Əbu Bəkr camaat namazında pişnamazlığa layiqdirsə, deməli, müsəlmanlara xəlifə (olmağa da layiqdir və Əbu bəkr bu işdə başqalarından qabaqcıldır.»(۲

:Əhli-sünnə bu hədisə iki səbəbə görə daha çox əhəmiyyət vermişlər

Bu hədis əhli-sünnənin mötəbər bildiyi kitablardan «Səhiheyn» və «Məsanid»də .۱ .müxtəlif sənədlərilə rəvayət olunmuşdur

Namaz ibadətlərin ən üstünüdür. Əgər Peyğəmbər (s) Əbu Bəkri bu işdə qabaqcıl .۲ .görürsə, deməli, bu məsələ Əbu Bəkrin xəlifə olmağa səlahiyyətini təsdiqləyir

:Cavab

Bu rəvayəti nəql edənlərin kim olduğu mə`lum deyil, bəzən bu rəvayətin Aişə .۱ tərəfindən nəql olunduğu deyilir. Aişənin belə bir rəvayət deməsi iki səbəbə görə ola :bilər

(a) Aişənin Həzrət Əliyə (ə) qarşı kin-küdurəti var idi.(۳)

səh:۵۲

---

Əl-ehticac»,c.۲. səh.۲۴۷» . [۱] -۱

Kəşşaful-ina»,c.۱. səh.۵۷۳ ; «Əl-məvaqif»,c.۸. səh.۳۶۵» . [۲] -۲

Fəthul-Bari»,c.۸. səh.۱۲۴» . [۳] -۳

Çünki, səhabələr Peyğəmbər (s) tərəfindən Həzrət Əlinin hamıdan üstün olmasına və) özündən sonra hakimiyyət və xilafətə yetişməsinin zərurətinə təkid etdiyini dəfələrlə eşitmişdilər. Hətta Peyğəmbər (s) bu məsələyə besətin əvvəlindən bəri israr edirdi. Allah-taala tərəfindən Peyğəmbərə (s) «öz yaxınlarına (ilahi əzabdan) xəbərdarlıq et!» (Şüəra, ٢١۴) əmr olunanda qohum-əqrəbasını bir məclisə yığıb onlara xitabən buyurdu: «Sizdən hansı biriniz tövhidə çağırışda mənə kömək edə bilər ki, mənim qardaşım, «?vəzirim və canişinim olsun

Peyğəmbərin (s) bu asimani çağırışına müsbət cavab verən yeganə şəxs yalnız Əli (ə) oldu. Bu məsələni hamı müşahidə etdikdən sonra həzrət Peyğəmbər (s) üzünü öz qohum-əqrəbasına tutub buyurdu: «Əli mənim qardaşım, vəsim və sizin aranızdakı (canişinimdir. Onun sözlərinə qulaq asın və ona itaət edin!»(١)

Aişənin Peyğəmbərin (s) bütün bu söylədiklərindən xəbəri var idi. Sadəcə olaraq,) (.Əliyə(ə) olan qəzəbi səbəb oldu ki, bacardıqca onun əleyhinə rəqib hazirlasin-müt

.b) Aişə Əbu Bəkrin qızı idi

Təbiidir ki, atasının fəxri onun fəxri sayılır. Bir şəxsin yaxşı və ya pis adam olmasını) (.dəqiqləşdirmək üçün onun qızından öyrənmək o qədər də məntiqə uyğun deyil – Müt

Peyğəmbər (s) başda Əbu Bəkr və Ömər olmaqla bütün səhabələrə Üsamənin .٢ qoşununda iştirak və ona itaət etməyə əmr etdi. Əbu Bəkrin pişnamaz durmasını !?nəzərə alaraq, Bu məsələni necə başa düşmək olar

Əsqəlani yazır: «Bu məsələni - yə`ni Əbu Bəkrə, Peyğəmbər (s) tərəfindən Üsamənin qoşununda iştirak etməyə əmr olunmasını Vaqidi, İbni Sə`d, İbni İshaq, İbni Covzi, (İbni Əsakir və başqaları öz kitablarında qeyd etmişlər.»(٢)

Elə buna görə də Üsamə, Əbu Bəkrə etiraz edərək onunla beyət etmədi və dedi: «Mən «!?Əbu Bəkrin başçısı olmuşam, indi necə onunla beyət edim

Peyğəmbər (s) səhabələrindən bir çoxuna (özünün .٣

Tarixi Təbəri»,c.٢. səh.۶٢ ; «Müsnədu Əhməd»,c.١. səh.١١١» . [١] -١

Aişə heç vaxt Əlinin (ə) xeyrini istəmirdi. «Müsnədu Əhməd»,c.۶. səh.٢٢٨; «Ət- . [٢] -٢ Təbəqatul-kübra»,c.٢. səh.٢٩; «Buxari»,c.١. səh.١٧٠, Əli (ə) buyurur: «...Onun (Aişənin) ürəyi həsəd və paxıllıqdan odun üzərindəki tavaya bənzəyir.» «Şərhu nəhcül-bəlağə», c.٢. səh.۴٣٩

olmadığı vaxt) onun yerində pişnamaz durmağa əmr edibdir. Lakin onlardan heç biri .imamət iddiası etməmişdir

Peyğəmbər (s) Əbu Bəkri mehrabdan kənara çəkərək özü camaat namazını qılmağa .۴ başladı. Əbu Bəkr bir dəfədən artıq pişnamaz durmadı. Hətta əgər fərz etsək ki, Əbu Bəkr bir neçə gün pişnamaz durmuşdur, Peyğəmbər xəstə olduğu və zəhmətlə yeridiyi vaxtda onu mehrabdan kənara çıxararaq özünün camaata pişnamazlıq etməsi (bunu göstərir ki, Peyğəmbər (s) Əbu Bəkri pişnamazlıqdan birdəfəlik kənarlaşdırdı.(۱

Həqiqətdə isə, Peyğəmbərin bu rəftarı Əbu Bəkrin pişnamazlıq məqamından .kənarlaşmasına, hətta qovulmasına dəlalət edir

Sünnilər iddia edirlər ki, Peyğəmbər (s) namazda Əbu Bəkrin arxasında durub ona .۵ !iqtida edirdi. Bu sözün mə`nası budur ki, Əbu Bəkr Peyğəmbərin (s) imamı olurdu

Sünnilər namazda fasiq, ədalətsiz şəxsə iqtida etməyi caiz bilirlər. Deməli, bu .۶ etiqada əsasən, Əbu Bəkrin pişnamaz durması onun üstünlüyünə və xilafətə layiq :olmasına dəlalət etmir

a). Əbu Hüreyrədən nəql olunur ki, Peyğəmbər (s) buyurdu: «Hər bir müsəlmanın arxasında durub namaz qılmaq sizə vacibdir. İstər o müsəlman yaxşı adam olsun, (istərsə pis; hətta böyük günahlara mürtəkib olsa belə, namazınızda ona iqtida edin.»(۲

b). Əbdülkərim Bəkkadan nəql olunur: Peyğəmbərin səhabələrindən on nəfəri (tanıyırdım ki, hamısı namazlarını zalım hakimlərə iqtida edib qılardılar.(۳

Şəvkani yazır: «Birinci əsrdə (h. q.) yaşayan səhabələr və tabein əməli şəkildə, bəlkə də .müqavilə əsasında namazda zalımlara iqtida etməyə icma etmişdilər

Çünki, o əsrlərdə yaşayan hakimlər, gündəlik namazlarda da pişnamaz durur, bütün şəhərlərdə camaatı istədikləri tərəfə çəkirdilər. Həmin vaxtlar hakimiyyət Bəni-Üməyyənin əlində idi. Bu qəbilədən olan hakimlərin vəziyyəti heç kimə gizli deyil. Necə ki, Buxari İbni Ömərin haqqında yazır: «O, namazda Həccaca (yüzminlərlə günahsız «.müsəlmanı öldürən zalım bir hakimə) iqtida edirdi

Müslim Səhihində və başqa əhli-sünnə alimləri yazırlar: Əbu Səid Xudri Mərvanın bayram namazında xübtəni namazdan qabaq oxuması və Peyğəmbərin (s) minbərini (məsciddən çölə çıxarması hadisəsində namazını Mərvana iqtida edib qıldı.(١)

Sünnü alimlərinin dediyinə əsasən, Peyğəmbər (s) ölüm yatağına düşmüşdü. Buna .٧ görə və ya qızdırmasının qalxdığına xatir (nəuzu billah) bihudə, əbəs sözlər danışırdı!! Bu halda onun dediyi sözlərin etibarı yoxdur. Elə buna görə də səhabələrdən kağız-qələm istədikdə, onlar «o, sayaqlayır, bihudə danışır!» deyə əmrinə itaət etmədilər. Əgər belədirsə (Allaha pənah!) onda Peyğəmbərin (s) bu halda söylədiyi əmrlərin heç biri etibarlı deyil: İstər kağız-qələm gətirməyə əmr etsin, istərsə də Əbu Bəkrin pişnamaz olmasına. (Çünki Əhli-sünnə Peyğəmbərin (s) ömrünün sonunda xəstəliyə düşdüyü vaxt Əbu Bəkrin pişnamaz olmasına əmr etdiyini daha çox təkid edirlər. (.Mütərcimdən

Necə olur ki, Peyğəmbərin namazda Əbu Bəkrə iqtida etməyi fəqət Aişəyə əmr .٨ etməsi Əbu Bəkrin xilafətə layiq olmasına dəlalət edir, lakin «Qədir Xum»da minlərlə səhabənin gözü önündə Peyğəmbərin (s) «Mən kimin rəhbəriyəmsə, Əli də onun rəhbəridir» – söyləməsi Həzrət Əlinin (ə) imamət məqamına təyin olunmasına dəlalət !?etmir

Çox güman ki, bu rəvayəti Aişə özündən qoşmuşdur və bu, onun siyasi .٩ .planlarındandır

Hədidi deyir:«Ustadımdan soruşdum: Siz heç deyirsinizmi ki, namazda pişnamaz ?(durmağı öz atasına Aişə tə`yin etdi, nəinki Peyğəmbər (s

Ustadım buyurdu: Yox, bu sözü mən demirəm, bu sözü Əli (ə) deyirdi. Mənim hökmüm onun hökmü ilə fərqlənir. O, Əbu Bəkrin namazında iştirak edirdi, mən isə iştirak .etmirdim

Yeddinci dəlil: Peyğəmbər (s) buyurur: «Mənim ümmətimin ən yaxşısı Əbu Bəkr, sonra .Ömərdir

:Cavab

Hədisin ardı vardır (ki, sünni mənbələrində zikr olunmuşdur), lakin inadkar adamlar o .١ hissəni demirlər... Həzrət Fatimə (s) soruşdu: «Ya Rəsuləllah, axı Əli haqqında bir söz demədin?!» Peyğəmbər buyurdu: «Ey Fatimə, Əli mənim özümdür. Sən kimi görmüsən «!?ki, özünü tərifləsin



---

Əvvəlki ünvan . [١] -١

.Bu hədisə əsasən Əli, Peyğəmbərdən sonra ən üstün şəxsiyyətdir

Bu hədisin sənədinə gəldikdə isə, o da etibarsızdır. Necə ki, «Tənzih» kitabında bu .٢ (məsələyə işarə olunmuşdur.(١

Səkkizinci dəlil: Peyğəmbər (s) buyurur: «Əgər Allahdan başqa birisini özümə dost «.seçsəydim, hökmən Əbu Bəkri özümə dost seçərdim

:Cavab

Sünnilərin dedikləri bu hədis, onların dedikləri başqa bir hədislə ziddir. Çünki, sünnilər .١ deyirlər ki, Peyğəmbər (s) Osmanı özünə dost seçdi: «Hər bir peyğəmbərin öz «.ümmətindən dostu vardır, mənim də dostum Osmandır

.Bu hədisə görə isə Osman, Əbu Bəkrdən üstün sayılır

Peyğəmbərin Əbu Bəkrlə dostluğu barəsində olan hədisin sənədi etibarsızdır.(٢) .٢ Çünki bu hədis Əbu Hüreyrənin dediyi hədislərin sırasında və Davud ibni Yəzid Əvdidən nəql olunmuşdur, o isə etimadlı şəxs deyildir. Necə ki, Heysəmi bu məsələyə .işarə etmişdir

Bu hədis başqa rəvayətlə – Aişədən, Əli ibni Əbdür-Rəhman Vasitinin nəqlilə zikr .٣ «.olmuşdur. Heysəmi yazır: «Mən bu şəxsi tanımıram

Bu hədisin (sənədinin etibarsız olmağından əlavə,) sünni mənbələrində axırı vardır ki, .۴ şiələrlə düşmənçilik edənlər hədisi axıra qədər demirlər. Hədisin axırı belədir: «... Lakin (dini qardaşlıq daha üstündür.»(٣

Hədisin axırı deyiləndən sonra Əbu Bəkrin başqa səhabələrdən üstün olmasının heç .bir mənası olmur

Doqquzuncu dəlil: Peyğəmbər (s) buyurur: «Məndən sonra camaatın ən yaxşısı Əbu «.Bəkr, sonra Ömərdir, ondan sonrasını isə Allah daha yaxşı bilir

:Cavab

Əbu Bəkrin özü etiraf etmişdir ki, camaatın ən yaxşısı deyil. O deyirdi: «Mən sizin .١ rəhbərinizəm, Halbuki, sizin aranızda ən yaxış adam deyiləm.» Həmçinin deyirdi: «Məni (rahat buraxın, (çünki) mən sizin ən yaxşınız deyiləm!»(۴

Müsəlmanların, həmçinin elm və mərifət əhli olan səhabələrin bir çoxu, o cümlədən .٢ ,Salman, Əbuzər, Miqdad



---

Tənzihuş-şəriətil-mərfuə... Ənil-əhadisil-işətil-mövzuə»,c.١. səh.٣۶٧» . [١] -١

Tənzihuş-şəriətil-mərfuə...» c.١. səh.٣٩٢» . [٢] -٢

Məcməuz-zəvaid»,c.٩. səh.۴۴» . [٣] -٣

İbni Sə`d, «Ət-təbəqatul-kubra»,c.٣. səh.١٩٩; «Məcməuz-zəvaid»,c.۵. səh.١٨٣ . [۴] -۴

Xəbbab, Cabir, Əbu Səid Xudri, Zeyd ibni Ərqəm,(١) Amir ibni Vasilə(٢) və...; habelə tabeindən Həkəm ibni Uteybə(٣) və başqaları Həzrət Əlini (ə) Əbu Bəkrdən üstün bilirdilər. İndi sizin nəzərinizcə adlarını saydığımız səhabələr və tabein Peyğəmbər (s) !?ilə müxalifətmi etmişlər

Onuncu dəlil: Peyğəmbər (s) buyurur: «(Axı) kim Əbu Bəkr kimi ola bilər?! O, elə etdi, «.belə etdi, məni evləndirdi, özünü mənim üçün fəda və malından mənə hədiyyə etdi

:Cavab

Hədisin sənədi etibarsızdır. Necə ki, Süyuti(۴) və İbni İraq(۵) bu hədisi saxta .١ .hədislərdən hesab etmişlər

Peyğəmbər (s) heç vaxt Əbu Bəkrin malına möhtac olmamışdır. Bu məsələyə hətta .٢ .İbni Teymiyyənin(۶) özü də təkid etmişdir

İzah: Həzrət Peyğəmbər (s) Xədicə (ə) ilə evlənməmişdən qabaq, Əbu Talibin (ə) evində və onun himayəsi altında qalırdı. Xədicə ilə evləndikdən sonra isə, onun bütün var-dövləti Peyğəmbərin (s) ixtiyarına keçdi. Bunların hamısı hicrətdən qabaq .olmuşdu

Peyğəmbərin (s) Məkkəni tərk edib Mədinəyə hicrət etdiyi zaman isə Əbu Bəkrin yanında cəmisi altı min dirhəm pul var idi. Bəlkə də səfər zamanı Peyğəmbərə (s) müəyyən qədər pul kömək etmişdir!! Lakin bu pul (ki, hələ Əbu Bəkr tərəfindən Peyğəmbərə (s) verilib-verilməməsi mə`lum deyil) Peyğəmbərin Mədinədə təşkil .etdiyi islam dövlətinin büdcəsi və xərcləri ilə müqayisədə olduqca dəyərsiz idi

Tarixdə Əbu Bəkrin Peyğəmbərə (s) və ya İslam hökumətinə köməyi .٣ görünməmişdir. Yalnız bir dəfə dövlətə bir at (yaxud dəvə) vermişdir ki, onun da pulunu Peyğəmbərdən (s) almışdır. İbni Kəsir, İbni Sə`d, İbni Haşim, Təbəri və Buxari (öz kitablarında bu məsələyə israr etmişlər.(٧



---

İbni Hazim, «Əl fəsil»,c.۴. səh.١٨١ ; «Təhzibul-kəmal»,c.٢٠. səh.٢٨٠ ; «Əl- istiyab». [١] -١

səh.۱۰۹۰

Əl-istiyab»,c.۴. səh.۲۶۰» . [۲] -۲

Siyəru ə`lamil-nübəla»,c.۵. səh.۲۰۹» . [۳] -۳

Əl-ləalil-məsnuə»,c.۱. səh.۲۹۵» . [۴] -۴

Tənzihuş-şəriətil-mərfuə...» c.۱. səh.۳۹۲, Zəhəbi başqa nəql ilə bu hədisi digər» . [۵] -۵ şəkildə rəvayət etmiş və «Siyəru ə`lamil-nübəla» kitabında hədisin sənədini etibarsız saymışdır.c.۲. səh.۳۶

Minhacus-sünnə»,c. ۴. səh.۲۸۹» . [۶] -۶

Əl-bidayətu vən-nihayə»,c.۳. səh.۱۸۴ ; «Ət-Təbaqatul-Kubra,c.۱. səh.۲۱۳ ; «Əs-» . [۷] -۷ Sirətun-Nəbəviyyə,c.۳. səh.۹۸ ; «Tarixu Təbəri»,c.۲. səh.۲۴۲ ; «Büxari»,c.۶. səh.۴۷

Əgər doğrudan da Əbu Bəkrin pulu var idisə, o zaman atası Əbu Quhafəyə kömək .۴ etməsi daha məsləhətə uyğun idi. Çünki onun atası bir qarın çörək üçün Abdullah ibni (Cəd`anın evində nökərçilik edirdi.(۱

Əbu Bəkrin sərvətli olması haqqında deyilən bütün rəvayətlərin sənədi saxtadır. .۵ Aişədən nəql olunur: «Cahiliyyət zamanı, atamın var-dövləti ilə fəxr edirdim. Onun min kisə min «uqiyə»si (müəyyən pul vahidi) var idi.» Peyğəmbər (s) mənə buyurdu: «Sakit «...ol

:Bu hədis aşağıdakı məsələləri mülahizə etdikdən sonra tamamilə etibarsız sayılır

a) Hədisin sənədində İbrahim ibni Yəqub Cozcani vardır ki, nasibi olmuşdur. Onun Əli (ibni Əbi Talib (ə) və Əhli-beytlə (ə) olan düşmənçiliyi məşhurdur.(۲

b) Zəhəbi Aişənin sözünə etiraz edərək yazır: «Aişənin kəlamındakı «Min kisə» kəlməsi, mə`lumdur ki, batil sözdür. Çünki, bu miqdar pul hətta onun zəmanəsinin sultanında «.da olmamışdır

c) Bunlardan əlavə, Aişə cahiliyyət zamanı(۳) dünyaya gəlməmişdi ki, atası ilə fəxr eləyə də bilsin. Çünki, o, Peyğəməbərin peyğəmbərlik məqamına çatmasından dörd, (yaxud beş il sonra dünyaya göz açmışdır.(۴

Mülahizə: Bə`zən Əbu Bəkrin Peyğəmbərə (s) kömək etməsi əfsanəsi, Ömər və Osmanın haqqında da nəql edilmiş və belə deyilmişdir ki, bu iki nəfər İslamın təbliğatı .üçün öz mallarından bir qismini Peyğəmbərin (s) ixtiyarında qoydular

:Etiraz

Məgər Ömər ibni Xəttabın nə qədər pulu, sərvəti var idi ki, öz ehtiyaclarını təmin .۱ etdikdən sonra hələ onun yarısınıda İslam yolunda infaq etsin?! Halbuki, o, cahiliyyət zamanı ya çobanlıq edir(۵), ya uzunqulaq satır(۶), ya odun daşıyırdı.(۷)Axı belə bir !?adamın haradan pulu olsun

Əl-əçani»,c.٨. səh.٣۴٢ ; «Müsamirətul-əvail», səh.٨٨; Kəlbi, «Əl-Məsalib», səh.٣» . [١] -١

Mizanul-etidal»,c.٣. səh.٣٧۵; «Təhzibut-təhzib»,c.٨. səh.٣٢۵» . [٢] -٢

Cahiliyyət zamanı» – Həzrət Məhəmmədin (s) peyğəmbərliyə yetişməmişdən» . [٣] -٣
.qabaqkı dövrə deyilir

Əl-İsabə»,c.۴. səh.٣۵٩» . [۴] -۴

Beyhəqi, «Əl-Məhasin vəl-məsavi», səh.٢٧۵ . [۵] -۵

Hənbəli, «Nihayətut-tələb», səh. ٢۵ . [۶] -۶

Əl-əqdul-fərid»,c.١. səh.۵٧» . [٧] -٧

Osman ibni Əffanın müsəlmanların «Əl-üsrə» qoşununa sərvət bəxşiş etməsi isə (bütün .tədqiqatçıların baxımından) saxta, qondarma rəvayətlərdəndir

Əhli-sünnə alimlərinin nəzərincə, «Bəqərə» surəsinin ۲۶۲-ci ayəsi Təbuk döyüşündə və) Osmanın haqqında nazil olmuşdur). Ayə belədir: «İnsanlardan bə`zisi öz mallarını Allah «...yolunda bəxşiş edir və sonradan heç bir minnət qoymurlar

Halbuki, bu ayə Peyğəmbər (s) Mədinəyə təzə hicrət edərkən nazil olmuş, Təbuk .döyüşü isə hicrətin doqquzuncu ili, rəcəb ayında baş vermişdir

Osmanın haqqında deyilmiş bu ayə başqa bir sünni aliminin-Beyzavinin təfsiri ilə . ۲ təzaddadır. Beyzavinin təfsirinə əsasən bu ayə Əbu Bəkrin haqqında nazil olmuşdur. Biz də sübut etdik ki, Əbu Bəkrin malı olmamışdır. (Deməli, ayə nə Əbu Bəkrin, nə də (.Osmanın haqqında nazil olmamışdır

Əhli-sünnə alimləri iddia edib deyirlər ki, Osman «Əl-üsrə» qoşununu dirçəltdi. . ۳ Bununla belə, onlar Osmanın iki yüz süvariyə kömək etdiyini qeyd edirlər. Halbuki, bu qoşunda dinc əhalidən əlavə, iyirmi beş min süvari əsgər var idi. İndi özünüz iddia ilə həqiqətin arasındakı fasiləyə baxın! (Və görün ki, iyirmi beş min nəfərlik qoşundan iki yüz nəfərə kömək etmək qoşunu dirçətmək deməkdirmi?!) Bəhsin sonunda sünni alimi :Əsqəlaninin sözünü nəzərinizə çatdırırıq

İmam Əhməd deyirdi ki, üç növ kitabın heç bir qayda-qanunu yoxdur: ۱. Peyğəmbərin» (s) döyüşləri haqda yazılmış kitablar. ۲. Təfsir. ۳. Ümumi mübahisələr və savaşlar haqda yazılmış kitablar. Mən fəzilətlər haqqında yazılmış kitabların dördüncü növ qaydasız kitablardan hesab olunmasını daha münasib bilirəm. Bu növ kitablar etibarsız ...və saxta rəvayətllərin töhfəsidir

Fəzilətlərə gəldikdə isə,... saysız-hesabsızdır. Görün, rafizilər Əhli-beytin fəzilətində özlərindən nə qədər hədis düzəltmişlər! Həmçinin əhli-sünnə nadanlıq ucbatından Müaviyə haqqında nə qədər fəzilətlər qoşmuşlar! Onlar bu cür saxta fəzilətləri ilk dəfə «.Əbu Bəkr və Ömər haqqında düzəldib yaymağa başladılar

(۱)

## ŞURA VƏ SEÇKİLƏR .۵

### ƏLİNİ (Ə) XİLAFƏTDƏN KƏNARLAŞDIRMAQ ÜÇÜN TƏŞKİL OLUNMUŞ ŞURA

Birinci xəlifənin hakimiyyətə yetişmə səbəbini nə icmada, nə də onun xüsusi ləyaqət və üstünlüyündə gördük. Əksinə, bu hakimiyyətin yalnız Ömər ibni Xəttabın isararları nəticəsində qurulmasını başa düşdük. Həmçinin, ikinci xəlifənin hakimiyyətinin birinci xəlifənin vəsiyyəti əsasında həyata keçməsi hamımıza aydın oldu. Dəqiq ibarətlə desək, Ömərin xilafətə yetişməsi Osmanın nəzəri, onun bu barədə Əbu Bəkrə məktub .yazması və Əbu Bəkrin onun məktubunu təsdiqləməsi nəticəsində baş verdi

Bu iki mərhələdən sonra, daha yaxşı olardı ki, ikinci xəlifənin «guya camaat ondan sonra rəhbərsiz qalmasın» – deyə təşkil etdiyi şuraya nəzər salaq. Ömər bu məsələdə özünü elə aparırdı ki, heç kəs onun hansısa müəyyən bir şəxs barəsində olan mövqeyini başa düşməsin. Lakin həqiqət tam başqa cür idi. O, hər bir vasitə ilə olursa olsun, Əlinin xilafətə yaxınlaşa bilməməsi və özündən sonra Osmanın hakimiyyətə gəlməsi üçün əlindən gələni əsirgəmirdi. Bu məsələyə gələn bəhslərdə geniş şəkildə işarə edəcəyik. Lakin hələlik bunu demək istəyirik ki, Peyğəmbərin (s) vəfatından sonra, hətta ondan qabaq belə, Həzrət Əlinin (ə) hakimiyyətə heç vaxt gələ bilməməsi və ümmətə rəhbər olmaması üçün proqramlar hazırlanmış, tədbirlər görülmüşdü. Onlar özlərinin şübhəli əməlləri, bə`zən də dillərindən qaçırtmaqla söylədiklərimizə .aydınlıq gətirmişlər

Onların Peyğəmbərə (s) sui-qəsd edərək təpədən uçuruma salmaq istəkələri, Peyğəmbərin Üsamənin qoşununa qoşulmağa israrla təkid etməsi və onunla müxalifət edənləri lənətləməsinə baxmayaraq, onun qoşununda iştirak etməmələri, Peyğəmbərə (s) «xəstə», «qızdırmalı» və bu kimi sair adlar qoymaqla onun vəsiyyət(1) yazmasına mane olmaları söylədiklərimizə bir daha aşkar sübutdur. Həmçinin, onlar Peyğəmbərin (s) hüzurunda səs-küy və dava-dalaş salıb o həzrətə hörmətsizlik edir, hökumət Həzrət Əliyə (ə) tərəf üz gətirib ona səs verəndə, o Həzrəti ölümlə ...hədələyirdilər

## ...ƏLİ (Ə) ADININ SƏSLƏNDİYİNİ EŞİTDİKDƏ ƏBU BƏKRİN

Əli (ə) adının səsləndiyini eşitdikdə Əbu Bəkirin göstərdiyi əksüləməl

Əbdüləziz Covhəri yazır: «Əbu Bəkr Həzrət Fatimənin «Fədək» barəsindəki xütbəsini eşitdikdə, qəzəblənərək minbərə çıxıb dedi: «Ey camaat, sizə nə olub ki, hər deyilənə qulaq asırsınız?! Peyğəmbər(s) zamanındakı ümid və arzular harada qaldı?!... ...Zəiflərdən kömək istəyir, qadınlardan mərhəmət diləyirsiniz

Agah olun! Mən istədiyimi deyir və dediklərimə də əməl edirəm. Mən tərk etdiyim «.şeylərin üstündə danışmıram

Sonra üzünü ənsara tutub dedi: «Ey ənsar! Sizin səfehlərinizin sözü mənim qulağıma çatdı. Siz Peyğəmbərin dövrünü daha gözəl xatırlayırsınız. Həqiqətən də Peyğəmbər sizə pənah gətirdi və siz ona kömək etdiniz. Bilin ki, mən öz içimizdən bir şeyə ləyaqəti (.olmayan şəxsə qarşı əliaçıq və mehriban deyiləm! (Sonra minbərdən aşağı endi

İbni Əbil Hədid yazır: « Nəqib Yəhya ibni Əbil-bəsirdən Əbu Bəkrin minbərdə dediyi :sözlərin mə`nası barədə soruşdum

?O kimə işarə edirdi –

!İşarə etmir, əksinə açıq-aydın şəkildə söyləyirdi –

.Əgər açıq şəkildə söyləsəydi, sizdən bu haqda soruşmazdım –

.O gülərək cavab verdi:- Əli ibni Əbu Talibə işarə edirdi

?Dediklərinin hamısı Əli (ə) barəsindədir –

.Bəli, oğlum, hakimiyyət belədir –

?Bəs ənsara sözləri nə idi –



---

Peyğəmbəri-Əkrəm ömrünün sonunda yatağa düşərkən buyurdu: «Kağız-qələm . [۱] -۱ gətirin, istəyirəm sizə elə bir şey yazam ki, məndən sonra yolunuzu azmayasınız.» Ömər bu zaman dedi: «Lazım deyil! Heç bir şey gətirməyin. Peyğəmbər sayaqlayır və «...nə dediyini bilmir

Onlar «Ya Əli!» deyərək fəryad çəkirdilər. Əbu Bəkr isə bu işin ağır və acınacaqlı – aqibətindən qorxub onları bu əməldən çəkindirirdi...(١)

## ...ƏLİ (Ə) ADININ SƏSLƏNDİYİNİ EŞİTDİKDƏ ÖMƏRİN

Buxari yazır: ...İbni Abbasdan belə nəql olunur: Mühacirlərin, o cümlədən Əbdürrəhmanın haqqında araşdırma aparırdım. Biz Minada həcc əməlini yerinə yetirəndə o, Ömər ibni Xəttabın yanında idi. Bir az sonra mənim yanıma gələrək dedi: Bu gün bir kişi mö`minlərin əmiri Ömərin hüzuruna gəlib dedi:

Ey mö`minlərin əmiri! Sənin «filankəs» haqqında nəzərin nədir? O deyir ki, əgər Ömər ölsəydi, filankəslə beyət edərdim. Allaha and olsun ki, Əbu Bəkrlə beyət qeyri-qanuni oldu.

Ömər qəzəblənərək cavab verdi: «İnşallah, bu gün günorta camaata e`lan edəcəyəm ki, onların hüquqlarına riayət etməyən şəxslərdən uzaqlaşsınlar...»(٢)

Cahiz yazır: O kişi belə deyirdi: «Əgər Ömər ölsəydi, Əli (ə) ilə beyət edərdim.»

Ömər bu sözləri eşitdikdə qəzəblənərək xütbə oxumağa qalxdı.»(٣)

## ÖMƏRİN OSMANIN ADININ SƏSLƏNMƏSİNƏ OLAN MÖVQEYİ

Harisə ibni Müzərribdən belə nəql olunur: Ömər ilə birlikdə həcc əməlini yerinə yetirirdik. Bu zaman bir məddah uca səslə oxuyurdu: «Ömərdən sonra xəlifə Osmandır!»(۴)

Bu işlər Ömərin gözü önündə baş verir, amma Ömər nə onu bu işdən çəkindirir, nə də bu məsələyə qarşı əksül-əməl göstərirdi. O, heç bir ehtiyac görmürdü ki, minbərə çıxıb camaatı bu cür şüarlar verməkdən çəkindirsin. Əksinə, o, Həzrət Əlinin (ə) İslam ümmətinə rəhbər ola bilməməsi və Osmanın, yaxud başqa bir şəxsin bu məqama nail olması üçün öz sə`yini göstərirdi. İndi isə bu fikrin sübutu üçün iki nümunəyə diqqət edin:

١. Bir gün Ömər ibni Xəttab Abdullah ibni Abbasa dedi: –

---

Şərhu nəhcil-bəlağə»,c.۱۶. səh.۲۱۵ ; «Əl-bihar»,c.۲۹, səh.۳۲۹» . [۱] -۱

Buxari»,c.۴. səh.۱۷۹» . [۲] -۲

Şərhu İbni Əbil-Hədid»,c.۲. səh.۲۲, ۲۵» . [۳] -۳

Siyəru Ə` lamil-nübəla», səh.۱۵۵; «İbni Əsakir», səh.۱۷۸» . [۴] -۴

?Ey Abdullah, tayfanızın sizə qarşı çıxması barədə fikrin nədir

Abdullah cavab verdi: Ey mö`minlərin əmiri! Bu haqda heç bir şey bilmirəm. Ömər dedi: Allah bu tayfanı özü bağışlasın! Sizin özünüz istəmədiniz ki, həm Peyğəmbər (s), həm (də xəlifə sizin tayfanızdan olsun və buna görə göylə gedib təkəbbür edəsiniz...(١)

İbni Abbas nəql edir ki, Ömər təzə xilafətə yetişərkən onun yanına getdim... O, . ٢ :məndən soruşdu

?Abdullah, haradan gəlirsən –

.Məsciddən –

?Əmin oğlundan nə xəbər –

:Abdullah ibni Cəfəri soruşduğunu güman edib belə cavab verdim

.Öz dostları ilə oynayır –

.Onu soruşmuram; Tayfanızın böyüyünü soruşuram –

Filankəsin xurma ağaclarını suvarmaq üçün quyudan su çəkir və özü də həmişə – .Qur`an oxumaqla məşğuldur

Ey Abdullah, əgər məndən bir şey gizlətsən, sənin boynuna dəvə qanının kəffarəsi– ?(cəriməsi) gələcək. De görüm, heç onun qəlbində xilafət arzusu qalıbdırmı

.Bəli –

!?Yoxsa o, Peyğəmbərin onun xəlifə olması haqda əmr etdiyini güman edir –

Bəli, bir az da artıq. Atamdan Əlinin söylədikləri barədə soruşdum və o, Əlini – .təsdiqlədi

Ömər dedi: – Doğrudur, Peyğəmbər Əlinin xəlifə olması haqda bir kəlam buyurmuşdur, lakin bu kəlam onun xəlifə olmasının zərurətini çıtdırmır. Həmçinin bə`zən Peyğəmbər onun şəxsiyyətinin böyüklüyü haqda hədislər buyururdu. Hətta, o,

ömrünün sonunda yataqda xəstə halda uzanarkən, özündən sonra Əlinin canişin olmasını yazmaq istədi. Lakin mən bu məsələnin pis aqibətindən qorxub onu bu işdən çəkindirdim. Çünki, Kəbənin Rəbbinə and olsun ki, Qüreyş heç vaxt Əlinin xəlifə olmasında ittifaq etməyəcəkdilər! Əgər Əli xilafətə yetişsəydi də, başqa şəhərlərin əhalisi onunla beyət etməyəcəkdilər. Peyğəmbər bildi ki, mən onun qəlbindən keçənlərdən xəbərim var. Ona görə o, bu işdən çəkindi, Allah da onu lazım olmayan bütün işlərdən çəkindirdi.(۲)



---

۱- [۱] . «Şərhu İbni Əbil-Hədid»,c.۲. səh.۲۲.

۲- [۲] . «Şərhu İbni Əbil-Hədid»,c.۱۲. səh.۲۰.

Bu rəvayəti Əhməd ibni Tahir özünün «Tarixu Bəğdad» adlı kitabında mötəbər sənədlə nəql etmişdir.

## ŞURA ƏHVALATI

### 1. Xəlifənin ömrünün sonu

Ömər ona olan sui-qəsddən sonra ölümünün yaxınlaşdığını hiss edərək dedi: Əgər Əbu Ubeydə Cərrah(1) sağ olsaydı, onu özümdən sonra xəlifə təyin edərdim. Çünki o bu ümmətin əmanətdarıdır. (Sonra dedi:) əgər Əbu Hüzeyfənin qulu Salim sağ olsaydı onu özümdən sonra xəlifə qərar verərdim. Çünki, o, Allahı daha çox sevirdi.

(Müəllif:) Bu iki nəfərin heç birinin İslam dininə xidməti olmamışdır. Bəli, Əbu Ubeydə, camaatı Əbu Bəkrin hökumətinə beyət etməyə məcbur edib və hətta bu işə görə Həzrət Zəhranın (s) evinə belə hücum etməyə tənbəllik etməmişdi.

Salimə gəldikdə isə, o, xilafətin Əhli-beytə (ə) heç vaxt nəsib olmaması üçün səy göstərən təşkilatçılardan idi.

### 2. Ömər özündən sonra xəlifə tə`yin edir

Ömərin adamları ondan, özündən sonra bir nəfəri xəlifə tə`yin etməsini xahiş edirlər. O əvvəlcə bu işdən imtina edərək deyir: «Nə sağlığımdan nə də öləndən sonra istəmirəm ki, yeni xəlifəni camaata məcburi şəkildə qəbul elətdirəm.» Sonradan isə öz fikrindən dönərək yeni xəlifə seçmək üçün şura təşkil edir. İbni Əbil-Hədid bu haqda yazır: vc «məcburi şəkildə yeni xəlifə tə`yin etmək Bundan artıq necə olmalıdır?! Axı nə fərqi var: istər Ömər özündən sonra xüsusi bir şəxsin adını çəkərək onu xəlifə e`lan etsin, istərsə də şuranı elə təşkil etsin ki, öz istədiyi şəxsdən başqa bir nəfərin seçilməsi qeyri-mümkün olsun?!»(2)

### 3. Altı nəfərlik seçki

Ömər səhabələrin arasından cəmisi altı nəfəri bu iş üçün təyin

١- [١]. Bir gün Əbu Ubeydə kənizindən soruşur: «Düzünü de görüm, qadınların mənim nəyimdən xoşları gəlmir?» Kəniz cavab verir: «Qadınların sənin tərinin iyindən çox acıqları gəlir. Çünki, sənin tərindən it tərinin iyi gəlir.» Bu zaman Əbu Ubeydə deyir: «Sən çox düz danışdın. Çünki, məni uşaq ikən it südü ilə böyüdüblər.» («Uyunul-əxbar»,c.٤. səh.٩٧)

٢- [٢]. «Şərhu Nəhcil-bəlağə»,c.١٢. səh.٢٦٠

etdi. Yalnız bu altı nəfər səhabə (Əli (ə), Sə`d ibni Əbi Vəqqas, Təlhə, Zübeyr, Osman .və Əbdür-rəhman) yeni xəlifəni tə`yin etməli idilər

### Zəkalı insan düşünməli .۴

Bəs nəyə görə yeni xəlifəni seçənlərdən biri Abbas olmamalı idi?! Axı niyə Peyğəmbərin (s) Əmmar ibni Yasir, Əbuzər və Miqdad kimi şəxsiyyətli səhabələri bu məclisdə iştirak etməməli idilər?! Hansı səbəbə görə bu məclisə ənsardan bir nəfər də olsun, də`vət olunmamışdır?! Halbuki, Əbu Bəkr ənsarın haqqında deyibdir: «Biz əmirlərik, siz isə vəzirlər.» Nəyə görə yalnız bir neçə Qüreyşinin (namizəd kimi) xəlifə !?seçkilərinə kifayət olundu

Belə bir şuranın sirri yalnız bu idi ki, onun üzvləri Həzrət Əlinin (ə) yolundan (davam .etdiyi Peyğəmbər sünnəsindən) kənara çıxmışdılar

:Şeyx Məhəmməd Hüseyn (Kaşiful-ğita) bu haqda yazır

Ömərin təşkil etdiyi şuranın adı şura, özəyi və həqiqəti isə siyasi hiyləgərlikdən başqa» bir şey deyildi. Ömər elə bir hiylə işlətdi ki, nəticədə heç bir problem qabağa gəlmədən (Osman müsəlmanların «seçilmiş xəlifəsi» kimi tanındı.»(١)

### Şura üzvləri ilə danışıq .۵

Ömər şuranın üzvlərinə xitab edərək dedi: «Sizin hamınızın məndən sonra xilafətə yetişməyə tamahınız vardır?» Hamı sakit qaldı. O, ikinci dəfə öz sualını təkrarladı. Bu zaman Zübeyr ayağa qalxıb dedi: Nəyə görə biz xəlifə ola bilməyək?! Sən xəlifə ola bildin və hökuməti idarə etdin, biz ki, səndən əskik deyilik! Biz Qüreyşin arasında, hətta İslamdan qabaq belə, böyük şəxsiyyət olmuşduq və həmçinin Peyğəmbərin (s) .yaxınlarından sayılırıq

Ömər üzünü ona tərəf tutaraq dedi:Ey Zübeyr, sənin tutduğun yol heç vaxt mə`lum .olmayıb! Kefin kök olan vaxtı mö`min, qəzəbli vaxtlarında isə kafir olursan

Bir gün insan olursan, bir gün şeytan. Əgər xilafət sənin əlinə keçsə daim bir neçə qram arpadan ötəri səhralıqda müharibə edərsən. Vay bu ümmətin halına, əgər sənin

!Nə qədər ki, sən bu xislətə maliksən, Allah ümmətin işini sənin öhdənə buraxmasın

Ömər üzünü Təlhəyə tutur. O, Təlhənin Əbu Bəkrin can verən günü «Sənin Ömərə qarşı fikrin nədir?» soruşduğu sualına görə, ondan acığı gəlirdi. Ömər Təlhədən soruşdu:- Danışım, yoxsa sakit qalım?! Təlhə cavab verdi: – De, onsuz da sən xeyirli !söz danışan adam deyilsən

Ömər danışmağa başladı: – Mən səni «Ühüd» döyüşündə barmağına dəyən xəsarətdən sonra yaxşı tanıdım. Qürurun sənə qalib gəlmişdi. Sənin hicab ayəsi nazil olduqda (dediyin cümlələrə görə, Peyğəmbər (s) ölənəcən səndən narazı qaldı.(١)

Sonra üzünü Sə`d ibni Əbi Vəqqasa tutub deyir: – Sən ovçusan; sənin işin ov, şikar, ox, !yay və bu cür işlərdir. Sən nə bilirsən axı xilafət və camaata rəhbərlik etmək nədir

Ömər Əbdürrəhman ibni Ovfa dedi: – Ey Əbdürrəhman, sənin imanını müsəlmanların imanının yarısı ilə ölçsələr, sənin imanın ağır gələr. Lakin hakimiyyət, sənin kimi zəif .insanların işi deyil

Ömər üzünü Əli ibni Əbi Talibə tutub deyir:-Allaha and olsun, əgər zarafatcıl olmasaydın, sən bu işə daha artıq layiq idin. Amma buna baxmayaraq, Allaha and olsun ki, əgər sən camaata rəhbərlik etsən, onları haqqa və düzgünlüyə də`vət .edəcəksən

Sonra üzünü Osmana tutaraq deyir: – Mən elə hiss edirəm ki, Qüreyş qəbiləsi səni çox istədikləri üçün xəlifə seçəcəklər, sən də Bəni-Üməyyə və Bəni-Mueyt tayfasını camaata başçı qoyub xalqın malını onlara yedizdirəcəksən. Bu işlərinin nəticəsində ərəb quldurlarından bir dəstəsi sənin başını yatdığın yerdə kəsəcəklər. Allaha and olsun, əgər Qüreyş səni xəlifə seçərsə, sən bu iki tayfanı hakimiyyətə gətirəcəksən və .bu işin nəticəsində quldurlar səni öldürəcəklər



---

Cahiz yazır: Hicab ayəsi nazil olduqda Təlhə dedi: «Peyğəmbərin qadınlarının . [١] -١ başlarına hicab bağlamalarının nə faydası vardır?! Onsuz da Peyğəmbər sabah-birisi

gün dünyadan köçəndən sonra onun arvadlarını alacağıq.» Təlhənin bu sözlərini Peyğəmbərə çatdırdılar. Cahiz yazır: Gərək bir nəfər Ömərə deyərdi ki, ay Ömər, özün deyirsən ki, Peyğəmbər dünyadan gedərkən bu altı səhabədən razı idi, bəs indi Təlhəyə necə deyirsən ki, Peyğəmbər (s) dünyadan gedərkən dediyin sözlərinə görə səndən acığı gəlirdi? ...Lakin kimin cürəti çatırdı ki, Ömərə belə bir söz desin?!

Sonra Ömər əlini Osmanın başına çəkərək dedi: – Əgər belə olarsa, məni yadına salıb !deyərsən: o, gələcəkdən xəbər verirdi

İbni Əbil–Hədid yazır: Bu xəbəri şeyximiz Əbu Osman «Süfyaniyyə» kitabında (yazmışdır.(۱

:Nəzarətçi bir qrupun «təyin» olunması .۶

Ömər xəlifə «seçkilərində» bir qrupu da bu işə nəzarət üçün tə`yin edərək dedi: – Ənsarın böyüklərindən bir neçəsini də`vət edin. Lakin onların sizin işinizə heç bir müdaxiləsi olmamalıdır. Həmçinin, Həsən ibni Əli (ə) və Abdullah ibni Abbası da bu münasibətlə də`vət edin. Çünki, onlar Peyğəmbərin yaxınlarıdır. Ümidvaram ki, siz (onların hüzurunda olsanız da, onlar sizin məsələnizə qarışmayacaqlar.(۲

## SEÇKİLƏRİN GEDİŞATI

### Diktatura .۱

Ömər qoşun başçısı Əbu Təlhə Ənsariyə belə əmr edir: «Ənsardan əlli nəfər kişini bura çağır və onları bir evə yığıb bu işin tez baş tutması üçün onlardan imza al. Özün də adamların ilə qapının ağzında dur ki, o altı nəfər tezliklə öz aralarından bir nəfəri seçsinlər. Əgər beş nəfər ittifaq edib bir nəfər müxalif olarsa, o bir nəfərin boynunu vur. Həmçinin, əgər dörd nəfər ittifaq edib iki nəfər müxalifət edərsə, o iki nəfərin boynunu vur. Yox, əgər üç nəfər ittifaq və digər üç nəfər müxalifətçilik edərsə Əbdürrəhman hansı dəstənin içərisində olsa həmin dəstəni himayə et. Əgər o biri dəstə öz müxalifətçiliklərinə israr edərlərsə hamısının boyunlarını vur. Yox, əgər şura üç günə qədər heç bir nəticəyə yetişməsə, o altı nəfərin hamısının boyunlarını vur və «.müsəlmanları özlərinə yeni rəhbər seçmək üçün seçkilərə də`vət et

### Şura üzvlərini qorxutmaq .۲

Ömər şura üzvlərini yeni xəlifə seçməyə tələsdirərək deyirdi: «Əgər Müaviyə və Əmr ibni As bu məsələdən xəbərdar olsa, o zaman özlərinə səs toplayaraq sizin hamınızdan «.qabağa keçəcəklər

Şərhu İbni Əbil-hədid»,c.١. səh.١٨۶; «Məsudi»,c.٣. səh.٢۵٣; «Tarixul-Təbəri»,c.٣» . [١] -١
səh.٢٩۴ ; «Tarixul-Mədinə», səh.٩٢۵ ; «Əl-kamil fit-tarix»,c. ٣. səh.٣۵

Hədidi.«Şərhu Nəhcil bəlağə»,c.١. səh.١٨٧ . [٢] -٢

Ömər bu sözü bilə-bilə deyirdi. Müaviyə və Əmr ibni Asa «yaşıl işıq» göstərməkdən məqsədi bu idi ki, əgər Əməvilərin şeyxi Osman xəlifə seçilməsə onda Müaviyə və Əmr ibni As öz şəhərlərini mərkəzdən ayırıb İslam dövlətinin qarşısında müstəqil bir dövlət qursunlar.

Ömər üzünü şura üzvlərinə tutub dedi: «Ey Məhəmmədin səhabələri! Əgər tezliklə bir nəticəyə yetişməsəniz, Əmr ibni As və Müaviyə sizə qalib gələcəklər!»

### ٣. Şeyx Müfidin təhlili

Şeyx Müfid buyurur: «Ömər bu sözləri ilə Müaviyə və Əmr ibni Ası xilafətə və hakimiyyətə yetişmək üçün həvəsləndirir və hərisliklərini bir az da artırırdı. Çünki, Müaviyə Ömərin Şam əyalətinə təyin etdiyi rəhbər və Əmr ibni Asda Misirə təyin etdiyi icra hakimi idi. Ömər Osmanın zəiflədiyi təqdirdə hakimiyyətin Əliyə (ə) tərəf üz gətirəcəyindən qorxurdu. Ona görə də bu sözü camaatın ağzına atdı ki, onu Misirə və Şama çatdırsınlar və əgər Əli (ə) hakimiyyətə yetişərsə, onlar bu iki məntəqəyə müstəqil şəkildə rəhbərlik etsinlər.»(١)

İmam Əli (ə) həqiqəti faş edir...

Həzrət Əli (ə) əmisi Abbasa buyurdu:Əmi, xilafəti (yenə də) bizdən kənarlaşdırdılar!

Abbas soruşdu: Kim bu işi gördü?

Həzrət cavab verdi: Osman (şurada) mənə yaxınlaşıb dedi: «Əksəriyyətlə ol!» Sonra dedi: «Əbdürrəhman ilə ol!» Əbdürrəhman Osmanın kürəkənidir. Təbiidir ki, onlar heç vaxt bir-birlərilə ixtilaf etməyəcəkdilər. Ya Əbdürrəhman Osmana, yaxudda Osman Əbdürrəhmana səs verəcəkdi.(٢)

İmam Əli (ə) məşhur xütbəsi «Şiqşiqiyyə»də buyurur: «Ömər ölümünün yaxınlaşdığını hiss etdikdə şura təşkil edərək o şuranın üzvlərinin arasından bir nəfəri özündən sonra xəlifə tə`yin etmək istədi, məni də o üzvlərin arasına qatdı. Bu şuranın şərrindən Allaha pənah aparıram! Birinci xəlifənin mənimlə yanaşı durmağa (müqayisə olunmağa) layiq olmamasında heç kimin şəkki olmamışdır. Lakin bu gün gör kimlər gəlib mənim kənarımda xilafət üçün namizəd olur?!»(٣)

---

۱- [۱] . «Şərhu İbni Əbil-Hədid»,c.۳. səh.۴۵۹۹

۲- [۲] . «Tarixil-Təbəri»,c.۵. səh.۳۵

۳- [۳] . «Nəhcil-bəlağə»,c.۱. səh.۲۵; Məsadiru Nəhcil-bəlağə və əsaniduh»

## ŞURA ÜZVLƏRİ BARƏDƏ ARAŞDIRMA

### İşarə

Hər kəs tarix səhifələrinə müraciət etsə və xəlifə seçkiləri üçün təşkil olunmuş şuranın üzvləri barədə araşdırma aparsa, bu üzvlərin Həzrət Əli (ə) ilə olan müxalifətçiliklərini .və ona qarşı kinlərini aydın şəkildə başa düşəcəkdir

### OSMAN .١

Əməvilərin şeyxi olan Osmanın Əhli-beytə (ə) və xüsusilə də Həzrət Əliyə (ə) qarşı ədavəti heç kimə gizli deyildi. Çünki həzrət Əli (ə) Peyğəmbərin (s) əmri ilə Osmanın kafir qohum əqrəbələrindən bir çoxunun (kafir və müşrikin) boynunu vurub .öldürmüşdü

### Əbdürrəhman ibni Ovf .٢

Əbdür-rəhman Osmanın kürəkəni idi (və təbiidir ki, o, Osmanın hökumətinin .(möhkəmlənməsi üçün əlindən gələni əsirgəməyəcəkdi

### Sə`d ibni Əbi Vəqqas .٣

Sə`din anası Himnə, Əbu Süfyanın qızı idi. Onun dayıları Əməvilərdən olduğu üçün o, Həzrət Əliyə (ə) qarşı kin-küdurətli idi. Elə buna görə də o, Osman öləndən sonra .Həzrət Əli (ə) ilə beyət etmədi

### Təlhə .٤

Təlhənin İmam Əliyə (ə) qarşı, onun əmisi Əbu Bəkrin xilafətini qeyri-qanuni bildiyi üçün, ədavəti var idi. Həmçinin, Aişənin Əmirəl-Mö`mininə (ə) olan kini Təlhənin kinini .bir az da çoxaldırdı

İmam Əli (ə) bu haqda buyurur: «(Mən dinin məsləhətinə görə onların kənarında qalmağa razı oldum.) Onlar quşlar kimi hər vaxt aşağı enirdilərsə, mən də onlarla birgə aşağı enir və hər vaxt göyə qalxırdılarsa mən də onlarla birgə göyə qalxırdım. (İslamın bütövlüyünü qorumaq üçün onlarla açıq şəkildə müxalifətə qalxmaq istəmirdim.) Lakin onlardan biri neçə illik kininə görə mənə səs vermədi və başqa birisi öz kürəkəninin

(tərəfində durdu və iş bu cür də qurtardı.»(١)

Əlaili bu barədə yazır: «Bu altı nəfər namizədi tə`yin etmək



---

١- [١] . «Nəhcil-bəlağə», Osman ilə beyətin səbəbləri.

Əməvilərə fəsad törətmək üçün əlverişli şərait yaratdı. Və nəhayət: bu seçkilərin nəticəsində Əməvilər öz saraylarını müsəlmanların çiyinlərində tikdilər. Seyyid Mir Əli Hindi bu barədə demişdir: «Ömərin müsəlmanların məsləhətinə görə bu altı nəfəri seçməyi və özündən qabaqkıların siyasətinə əməl etməməyi Əməvilərin fitnə-fəsadları ilə tamamlandı. Çünki, Mədinədə onların güclü tərəfdarları var idi. Onsuz da Əməvilər əvvəlcədən İslamla düşmən olub bu dinə qarşı müharibə etmişdilər. Sonradan isə bu dini, maddi mənafeləri üçün qəbul edib nəticədə öz şahlıq saraylarını (müsəlmanların çiyinlərinin üzərində tikdilər.»(١)

## ŞURANIN MÜƏMMALI İŞLƏRİ

١. Ümumiyyətlə, üçüncü xəlifə seçkilərində (birinci və ikinci xəlifə seçkilərində olduğu kimi) xalqın hüququna riayət olunmadı. Çünki bu seçkilərdə xalqın iştirakı qadağan idi. Həmçinin, şura üzvlərinin də azad şəkildə seçim hüquqları yox idi.

٢. Şura üzvlərinin hamısının İmam Əli (ə) ilə ədavətləri var idi.

٣. Ənsarın üzv olaraq şurada iştirak etmələrinə qadağa qoyuldu.

۴. Əbdürrəhman ibni Ovfun səs vermədə başqalarına imtiyazı var idi.

۵. Altı nəfərin namizədliyinə «Peyğəmbər (s) dünyadan gedərkən bu altı səhabədən razı idi.» bəhanəsi ilə kifayətlənildi. Halbuki, Peyğəmbər (s) dünyasını dəyişərkən çoxlu səhabələrdən razı idi və bu məsələni yalnız altı nəfərdə xülasələnir. Əslində onların nəzərinə görə Peyğəmbər (s) «Şəcərə» beyətində olan bütün səhabələrdən razı idi. Üstəlik əhli-sünnənin əqidəsinə əsasən, səhabələrin hamısı ədalətli olduqları üçün, Peyğəmbər (s) onların hamısından razı idi.

۶. Şura,öz üzvlərinin arasında ixtilafa səbəb oldu. Belə ki, Zübeyr hələ Ömər ölməmişdən qabaq deyirdi: «Allaha and olsun, Ömər öləndən sonra Əlidən başqa heç kimlə beyət etməyəcəyəm!»

## MÜAVİYƏNİN ŞURA BARƏDƏ NƏZƏRİ

Ömərin təşkil etdiyi şuranın Əməvilərin, xüsusilə də

Müaviyənin hakimiyyətə yetişməsi və camaata ağalıq etmələri ilə nəticələnsə də belə, Müaviyə bu şuranı müsəlmanları ixtilafa düçar edib parçalayan əsas amil sayır. Elə buna görə də, həmin şuranı dəfələrlə məhkum etmişdir. Necə ki, bir gün Müaviyə Əbu Hüseyndən soruşdu: Eşitdiyimə görə sən çox ağıllı və dərrakəli insansan. De görüm, ?səndən nə haqda sual soruşum

.Əbu Hüseyn cavab verdi: Hər nə barədə istəyirsənsə soruş

Müaviyə dedi: De görüm hansı amil səbəb oldu ki, müsəlmanların arasında ixtilaf və ?pərakəndəlik düşsün

(.Osmanın ölümü! (Əbu Hüseyn bu sözlə Müaviyəyə yaxınlaşmaq istəyirdi –

!Yox, bu səbəb olmadı –

Əlinin səninlə döyüşməsi –

Yox, bu da deyil –

.Bəli, mən həqiqəti açıqlayıram –

Müaviyə deyir: Doğrudan da dediklərinin heç biri müsəlmanların pərakəndəliyinə səbəb deyil. Səbəb yalnız altı nəfərdən təşkil olunmuş şura idi. Allah taala kafirlərin bu işdən xoşları gəlməsə də belə Məhəmmədi hidayət nuru və haqq din ilə camaata Peyğəmbər göndərdi. Peyğəmbər Allahın bütün əmrlərinə əməl etdikdən sonra, Tanrı onun ruhunu aldı və Əbu Bəkri imam-camaat etdi. Xalq da onu öz dünyalarını təmin etmək üçün rəhbər seçdilər. Əbu Bəkr ömrünün axırlarında Öməri özündən sonrakı xəlifə təyin etdi. Ömər uzun müddət Əbu Bəkrin siyasətinə əməl etsə də, ömrünün axırlarında yeni xəlifə təyin etmək üçün təzə bir siyasətə əl atdı: yeni xəlifə təyin etmək üçün altı nəfərlik şura təşkil edir. Bu altı nəfərdən hər biri xilafəti yalnız öz şəxsi (mənafelərinə görə istəyirdilər.(١)



---

Müaviyənin Həzrət Əli (ə) ilə olan düşmənçiliyi hamıya bəllidir. Təbiidir ki, o, . [١] -١

Həzrət Əlini (ə) də digər namizədlərin sırasında dünyapərəst bir adam kimi hesablamalıdır. Lakin tarix və hətta Müaviyənin özü də bu məsələnin tam əksinə olduğunu bilir. Həzrət Əli (ə) heç vaxt dünyaya ürək bağlamamış, dünyanı üzü zərli, içi zəhərli ilana bənzətmişdir. Başqa ibarətlərində dünyanı keçinin burun suyu və çəyirtkənin ağzında çeynənilmiş köhnə yarpaqdan da qiymətsiz saymışdır. O, dünyanı yalnız Allaha ibadət və onun bəndələrinə xidmət üçün fürsət saymışdır. Həzrət Əli (ə) rəhbərlik dövründə bütün çətinliklərə baxmayaraq, şəxsən özü xalqın işlərinə yetişir, onların problemləri ilə maraqlanırdı. O, hakimiyyətdə olduğu müddətdə beytül-maldan bir dirhəm də (pul vahidi) özü və yaxınları üçün istifadə etmədi. Xalq onunla beyət etdikdə minbərə→ ←çıxıb buyurdu: «Allaha and olsun, nə qədər ki, Mədinədə tək bir xurma ağacım var, özümə beytül-maldan bir qram da götürməyəcəyəm». Qardaşı Əqil ayağa qalxıb dedi: «Məni Mədinədə yaşayan zənci ilə bir tutursan?» Əli (ə) belə byururdu: «Otur qardaşım! Sənin o zənci ilə iman və təqvadan başqa heç bir fərqin ola bilməz.» Daha sonra İmam e`lan etdi ki, hökumətində ayrı-seçkiliyə yol .verilməyəcəkdir. – Mürtərcimdən

Onların tayfaları da, öz mənafelərinə görə onların xilafətini arzulayırdılar. Əgər Ömər Əbu Bəkrin yolunu axıracan gedib özündən sonra bir nəfərin xəlifə olmasını vəsiyyət etsəydi müsəlmanların arasında ixtilaf düşməzdi.(۱) (Lakin onun təşkil etdiyi şura (.pərakəndəliyin bünövrəsini qoydu

## TOPLANTI

Şura üzvləri qabaqcadan təyin olunmuş məkana toplaşdılar. Bə`zi rəvayətlərə görə bu məkan Misvər ibni Müxrəmənin evi idi. Məclisdə söhbət bundan gedirdi ki, kim xəlifə :olmağa daha layiqdir? Bu zaman Əmirəl-mö`minin Əli (ə) buyurdu

Sizin heç biriniz məndən qabaq xalqı haqqa tərəf dəvət etməmisiniz. Mən sizin» hamınızdan əvvəl yaxınlara, qohum-əqrəbalara baş çəkməyə və Allahın bandələrinə yaxşılıq edib kömək etməyə başlamışam. Deməli, siz mənim sözlərimə qulaq asmalı və məntiqimi dinləməlisiniz. Çox güman ki, bu gündən belə (sizin Osmanı xəlifə seçdiyiniz üçün) xalq tərəfindən hakimiyyətin əleyhinə qılınclar qalxacaq və əhd-peymanlar pozulacaq. İş o yerə çatacaq ki, sizin bə`ziləriniz azğın qruplara rəhbərlik və (cahillərdən də artıq nadanlıq edəcəksiniz!»(۲

## ƏBU TƏLHƏNİN TƏHDİD ETMƏSİ

Əbu Təlhə iclasa daxil olub dedi: «O Allaha And olsun ki, Ömərin canı Onun əlindədi, sizin yalnız üç gün vaxtınız vardır və sizə bu müddətdən artıq möhlət verilməyəcəkdir. «.Tez bir zamanda aranızdan bir rəhbər seçin

Nəhayət üçüncü gün yetişdi... Təlhə ayağa qalxıb öz namizədlik hüququnun Osmana həvalə olunmasını e`lan etdi. Təlhənin bu işi uzun illər boyu Həzrət Əliyə (ə) olan kin-küdurətindən irəli gəlirdi. Amma Zübeyr ayağa qalxıb İmam Əlinin (ə) hakimiyyətə yetişməsini dəstəklədi. Sə`d ibni Əbi Vəqqas isə öz hüququnu Əbdürrəhamana həvalə etdi. (Təbiidir ki, Əbdürrəhman da öz kürəkəni Osmana səs verəcəkdi. Elə bu cür də (.oldu



---

Əl-əqdül-fərid»,c.۳. səh.۷۳» . [۱] -۱

Nəticədə İmam Əli (ə) bir səs gətirdiyi üçün hakimiyyətdən kənarlaşdı. (Osman isə iki (.səslə xilafətə yetişdi

ƏBDÜRRƏHMAN İBNİ OVFUN MÖVQEYİ

Əbdürrəhman ibni Ovf öz bacısı oğlu Misvəri çağırıb dedi: Ey Misvər, get Əlini və .Osmanı çağır, camaatı da bura topla

Camaat yığışıb Əbdürrəhmanın yanına gəldikdə) üzünü onlara tutub dedi: Ey camaat,) !mənimlə məsləhətləşin

Əmmar ayağa qalxıb dedi:  Əgər istəyirsənsə müsəlmanların arasında ixtilaf .düşməsin, onda Əliyə (ə) səs ver

Miqdad ayağa qalxıb dedi:  Əmmarın sözünə qulaq as! Əgər sən Əliyə (ə) səs versən, .biz onun buyurduqlarına qulaq asıb və ona itaət edəcəyik

Bu zaman Əməvilərin başçıları Əmmar və Miqdadın belə çıxışlarından ciddi şəkildə narahat olub onların sözlərini məhkum və ibni Ovfu Əməvilərin böyüyü Osmana səs verməyə dəvət etdilər. Abdullah ibni Əbi Sərəh(۱) ayağa qalxıb uca səslə dedi:  Əgər .istəyirsənsə Qüreyş qəbiləsinin arasında ixtilaf düşməsin, onda Osmana səs ver

Bu zaman Abdullah ibni Əbi Rəbiə Məxzumi(۲) ayağa qalxıb dedi: Doğru deyir! Əgər !sən Osmana səs versən, biz onun əmrlərinə tabe olacağıq

Əmmar çox narahat halda ayağa qalxıb İbni Əbi Sərəhə

səh:۷۴

---

O, Osmanın süd qardaşı idi və sonralar Osman tərəfindən Misirə hakim tə`yin . [۱] -۱ olundu. Peyğəmbərin (s) zamanında o həzrətə xəbər verdilər ki, Əbi Sərəh mürtəd olmuş və kafirlərə qoşulmuşdur. Peyğəmbər (s) əmr etdi ki, onu öldürsünlər. Lakin Osman ona pənah verdi (və Peyğəmbərin (s) əmrinin əleyhinə əməl etdi.) – («Ə`lamul- (nübəla», c.۳. səh.۴۳, və digər məşhur mənbələr

O, Əmr ibni Asla birlikdə Məkkədən Həbəşistana hicrət etmiş səhabələri zorla . [۲] -۲

Məkkəyə qaytarıb və onlara yenidən işkəncə və əzab-əziyyət vermək məqsədi ilə Həbəşistana getmişdi. Həmçinin o, Məkkənin fəth olunduğu gün Əbu Talibin qızı Ümmü Haninin evinə pənah apardı. Haris ibni Hişam da orada idi. Peyğəmbər (s) onların hər ikisinin qətlinə fərman verdi. Əli (ə) onları öldürmək istədikdə Ümmü Hani onun qarşısını aldı. Peyğəmbər (s) Ümmü Haninin evinə gəldi. Ümmü Hani onların bağışlanmasını Peyğəmbərdən (s) xahiş etdi. Bu zaman Peyğəmbər (s) buyurdu: «Sən onlara pənah verdiyin üçün biz də onlara pənah verdik.» Nəhayət, Abdullah ibni Rəbiə Məxzumi Osmanın mühasirədə olduğu zaman ona kömək etmək məqsədi ilə gəlmək istədikdə Məkkənin yaxınlığında dəvəsindən yıxılıb öldü. «Əl-istiyab»,c.٣. səh.٢٣ ; «Əl-kamil fit-tarix»,c.٣. səh.٧٠ ; «Qamusur-rical»,c.۶. səh.٢٢۵ ; «Təhzibut-təhzib»,c.۵. səh.٩٢.

nalayiq sözlər dedi və çox qəzəbli halda ona söylədi: Nə vaxtdan ürəyin İslam üçün !?yanır

Bu zaman Miqdad ayağa durdu və dedi: Əmmar nə deyirsə düzdür. İbni Əbi Sərəh həmişə Peyğəmbərə qarşı ədavətli və o həzrətin qatı düşməni olmuşdur. Peyğəmbər (ə) Məkkəni fəth etdiyi zaman buyurdu ki, «onu hətta Kəbənin pərdəsindən yapışsa da, tutub öldürsünlər.» Bəli, bu cür insanlar həmişə müsəlmanların işlərinə dəxalət edib .acınacaqlı vəziyyət yaradırlar

Bəni-Haşim və Bəni-Üməyyə öz fikirlərini deyir və dərhal bir-birlərinə qarşı kəskin .mövqe tutaraq etiraz edirdilər

Bu zaman Əmmar ayağa qalxıb söylədi: Ay camaat, Allah-taala sizi Öz Peyğəmbəri ilə şərəfli etdi və Öz dini ilə əzizlədi. Amma siz necə?! Axı nə vaxta qədər bu işi (xilafəti) öz !?Peyğəmbərinizin Əhli-beytindən kənarlaşdırmaq istəyirsiniz

Əmmar Həzrət Əlinin (ə) haqqını müdafiə etdiyi zaman, Məxzum qəbiləsindən olan bir kişi ayağa qalxıb Əmmarın sözünü kəsərək dedi: Ey Süməyyənin oğlu, öz həddini bil! !?Axı Qüreyş öz arasından rəhbər seçir, sənə nə var

Bəli, Məxzum qəbiləsindən olan kişi Məhəmməd Peyğəmbərin (s) Əmmarın əzəməti haqda buyurduğu «Əmmar həmişə haqq ilədir.» hədisini unutmuşdur. Sə`d ayağa qalxıb üzün İbni Ovfa tutaraq dedi: Nə qədər ki, camaatın arasında ixtilaf düşməyib, işi !tamamla

Əlbəttə, hamı Sədin məqsədini başa düşürdü: O, Qur`ani-Kərimdə lənətlənmiş !Şəcərənin (Bəni-Üməyyə nəslinin) hakimiyyətə gəlməsini istəyirdi

Nəhayət, Əbdürrəhman üzünü İmam Əli (ə)-a tutub dedi: Səninlə bu şərtlə beyət edərəm ki, Allahın kitabına, Peyğəmbərin sünnəsinə, Əbu Bəkr və Ömərin yoluna əməl ?edəsən. Şərtimi qəbul edirsənmi

Həzrət Əli (ə) çox təəccüblə ona baxaraq Əbdür-rəhman ibni Ovf və onun kimilərin heç vaxt başa düşmədiyi İslam məntiqini ona anlatdı: Mən yalnız Allahın kitabına, Peyğəmbərin sünnəsinə,(١) və həmçinin özümün məntiqlə düşündüyümə əməl

.edəcəyəm

səh:٧٥

---

Tarixi Yəqubi»,c.٢. səh.١۶٢; «Üsdul-ğabə»,c.۴. səh.٣٢; Cövhəri. «Səqifə», səh.٨١ ;» . [١] -١
«Tarixi Təbəri», c.٣. səh.٢٩٧; «Tarixi ibni Xəldun»,c.٢. səh.١٢۶; «Tarixi Mədinə»,c.٣. səh.٩٣٠;
.Cəssas. «Əl-füsul fil-cüsus»,c.۴. səh.۵۵

Qəribədir: Məgər Əbu Bəkr və Ömər həmişə bir-birləri ilə müxalifət etmirdilərmi?! Əbu Bəkr Uyeynə və Əqrəyə məktub yazıb imzalanmış şəkildə Ömər ibni Xattaba !?göndərəndə, Ömər ağız suyunu məktuba atıb onu cırmadımı

Əgər Əli (ə), Əbu Bəkr və Ömərin yoluna əməl etmək şərti ilə xilafəti qəbul etsəydi, onların hansı birinin yoluna əməl edəcəkdi?! Əbu Bəkr, Malik ibni Nuveyrənin qatili ...barəsində bir söz, Ömər ibni Xəttab isə tam başqa bir zidd söz deyirdi və

Sonda İbni Ovf, İmam Əlinin (ə) onun şərtlərini kamil şəkildə qəbul etmədiyini gördükdə, üzünü Osmana tutub həmin şərtlərini dedi. Osman azacıq belə, tərədüd etmədən onun şərtlərini qəbul etdi, əlini İbni Ovfa uzadıb bir-birlərinin əllərini möhkəm sıxdılar. İbni Ovf dedi: İlahi, (şahid ol) boynumda olan vəzifəni Osmana «!həvalə etdim

Ömərin təşkil etdiyi şura sayəsində Əməvilərin böyükləri olan Osmanın hakimiyyətə ...yetişməsi ilə bu qəbilənin sevinc fəryadları göyə ucaldı

### XİTABLAR VƏ MÖVQELƏR

:İmam Əlinin (ə) ibni Ovfa xitabı .۱

İmam Əli (ə) ümmətin halına acıdığı üçün qəm-qüssəyə qərq olmuş halda üzünü İbni Ovfa tutub buyurdu: – And olsun Allaha ki, sənin bu işin böyüklərinin (Əbu Bəkr və Ömərin) işi kimi ümidə (xilafət ümidinə) görə idi. Necə ki, Ömər Əbu Bəkri xəlifə .seçməklə özünün xəlifə olmasına zəminə hazırladı

:İmam Əlinin (ə) Qüreyşə xitabı .۲

İmam Əli (ə) üzünü Qüreyşə tutub buyurdu: «Bu, sizin birinci dəfəniz deyil ki, bir-birinizlə əlbir olaraq bizim əleyhimizə çıxasınız. Səbir etmək daha gözəldir. Allah Öz !bəndəsinə, ona nisbət verilən töhmətlərin qarşısında kömək edir

:İbni Ovf Xeybər qəhrəmanını (Əlini (ə)) hədələyir .۳

İbni Ovf ayağa qalxıb İmam Əlini (ə) hədələməyə başlayır: Ey Əli! elə bir iş görmə ki, .sənin haqda pis tədbirlər tökək

İmam Əli (ə) bu sözü eşitdikdən sonra məscidi tərk edərək qəmli halda buyururdu: .İnşaallah tezliklə öz cəzanıza çatarsınız

:Əmmarın İbni Ovfa xitabı .۴

Əmmar üzünü Əbdür-Rəhman ibni Ovfa tutub buyurur: – Ey Əbdür-Rəhman, Allaha and olsun ki, sən Əliyə (ə) qarşı çıxdın. Halbuki, Əli yalnız haqla hökm edir və o, haqqın .ölçüsü, meyarıdır

:Miqdadın mövqeyi .۵

Miqdad məsciddən çıxanda deyirdi: Allaha and olsun, Peyğəmbərdən (s) sonra bu Əhli-beytə (ə) o qədər zülm olundu ki, mən heç vaxt bu cür zülm görməmişdim! Mən Qüreyşin rəftarına çox təəccüb edirəm!! Elə bir kişidən üz döndərdilər ki, həmişə ədalətlə hökm etmişdir və heç kim onun qədər alim və pak deyil. And olsun Tanrıya, ...əgər mənə kömək edən olsaydı

:İbni Ovfun əksül-əməli .۶

İbni Ovf Miqdadın sözünü kəsərək deyir: Miqdad, Allahdan qorx! Mən sənin şərrindən .qorxuram

Qüreyşin şura vasitəsi ilə İmam Əliyə (ə) qarşı qurduğu məkrli proqram elə burada da !sona çatdı. Səbir daha gözəldir. Allah bizim köməkçimizdir

## !İBNİ OVFA ETİRAZ

Əbu Vaildən belə nəql olunur: Əbdür-Rəhmana etiraz edib dedim: «Nə üçün Osmanla be`yət etdin və Əliyə səs vermədin?» O, belə cavab verdi: «Mənim heç bir günahım yoxdur. Mən Əliyə dedim ki, Allahın kitabına, Peyğəmbərin (s) sünnəsinə, Əbu Bəkr və Ömərin yoluna əməl etmək şərti ilə səninlə beyət etmək istəyirəm. O, bu təklifin sonuncu hissəsini (Əbu Bəkr və Ömərin yolunu) qəbul etmədi. Lakin Osman mənim (şərtimi qəbul etdi.(۱

## OXUCUNUN NƏZƏRİNƏ

Əbdürrəhman Həzrət Əli (ə) ilə, «təkcə Allahın kitabına və Peyğəmbərin (s) sünnəsinə əməl etmək» əsasında beyət edə bilməzdimi?! Məgər Allahın kitabı və Peyğəmbərin (s) sünnəsində nöqsan var idimi ki, iki xəlifənin yolunu qəbul etməməyi ona eyb saysın?? Osmanın bu şərti qəbul etməsi onun Əliyə (ə) üstünlüyünü isbat edirmi?! Məgər !!?müsəlmanlara rəhbərlik o iki xəlifənin yoluna əməl etməyə bağlıdır

Halbuki, Peyğəmbər (s) Əli haqda buyurmuşdur: «Əli haqq ilə haqq da Əli ilədir. Əlinin bütün işləri haqq üzündəndir.» Bu hədisə əsasən, Həzrət Əlinin (ə) Əbu Bəkr və Ömərin

yolunu qəbul etməməsi bu iki şəxsin haqqa (Qur`an və sünnəyə) əməl etməmələrinə dəlalət edir. Həzrət Əli (ə) heç kimi boş yerə tərifləmir və heç kimə yaltaqlıq etmir, məhz buna görə də o iki



---

۱-[۱]. «Müsnədu Əhməd»,c.۱. səh.۷۵; «Fəthul-Bari»,c.۱۳, səh.۱۷۰.

xəlifənin yolunu çox aydın şəkildə rədd və bununla da onların tutduğu yolun Qur`an və .sünnə ilə müxalif olmasına bir daha təkid edir

Həzrət Əli (ə) heç zaman şəxsi mənafeyinə görə kimisə tərifləməmiş, heç vaxt riyakarlıq etməmişdir. Əksinə, hətta özündən qabaqkı iki xəlifənin yolunu tam qətiyyətlə rədd etməklə hakimiyyətdən belə kənarlaşır. Gördüyünüz kimi, Əli (ə) öz sözünü dedi, həqiqəti gizlətmədi. Doğrudan da Həzrət Əlidən (ə) bundan başqa heç bir .şey gözləmək olmazdı

## ÖMƏRİN OSMANI DƏSTƏKLƏMƏSİNİN SƏBƏBİ

Tarixçilərin fikrincə Ömərin şura təşkil etməklə Əməvilərin şeyxi olan Osmanı xəlifə seçdirməsində məqsədi, Osmanın keçmişdə Ömərə yaxşılıq etməsinin əvəzini çıxmaq idi. Çünki, Əbu Bəkr dünyadan gedən zaman Osmanı çağırtdırıb onunla yeni xəlifə barəsində məsləhətləşdi və məsləhət bildiyi şəxsin adını vəsiyyətnamədə yazmasını .ondan istədi. O da Ömər ibni Xəttabın adını yazdı

Müttəqi Hindi bu hadisəni belə yazır: «Osman ibni Übeydullah ibni Ömərdən nəql olunur ki, Əbu Bəkr əcəlinin yaxınlaşdığını hiss etdikdə Osmanı çağırıb vəsiyyətini ona yazdırır. Lakin Əbu Bəkr, hələ təzə xəlifənin təyin etməmişdən qabaq huşdan gedir. Osman bu .zaman Ömər ibni Xəttabın adını vəsiyyətnamədə yazdı

«?Əbu Bəkr huşa gəlib Osmandan soruşdu: «Xilafət üçün bir şəxsin adını yazdınmı

Osman cavab verdi: Ümmətin arasında ixtilaf düşməsin deyə, Ömər ibni Xəttabın .adını yazdım. Məncə, elə sizin nəzəriniz də budur

.Əbu Bəkr dedi: Allah köməyin olsun! Elə öz adını da yazsaydın, bu işə layiq idin

Bu hadisədən sonra Təlhə ibni Übeydullah Əbu Bəkrin yanına gəlib dedi: Mən bir qrup tərəfindən nümayəndə seçilmişəm; onlar deyirlər: «Ömər hələ Əbu Bəkrin sağlığında bizimlə kobud və pis rəftar edirdi, görün Əbu Bəkrdən sonra bizimlə necə pis rəftar edəcəkdir!» Əgər hakimiyyəti Ömərə tapşırsan, Allah səni (qiyamət günü) mühakiməyə !?çəkəcəkdir. İndi bax gör nə edirsən

Əbu Bəkr dedi: Əyləşin! Məni Allahla qorxudursunuz?! Əgər Allah məni mühakimə etsə deyəcəyəm: «Sənin

bəndələrinin arasından ən yaxşı şəxsi xəlifə təyin etdim.» Get bu sözümü camaata (səni nümayəndə təyin edən qrupa) çatdır.(١)

.Gördüyünüz kimi, bu fikir yalnız Əbu Bəkrə məxsus idi, ümmət isə belə fikirləşmirdi

## ? HƏZRƏT ƏLİNİ (Ə) BAŞQALARI İLƏ MÜQAYİSƏ ETMƏK OLARMI

Həzrət Məhəmməd Peyğəmbərdən (s) sonra Əlidən (ə) üstün bir şəxs vardırmı?! Bu haqda böyük sünni alimi İbni Əbil-Hədid yazır: «Həzrət Əlinin (ə) «Xəndək» döyüşündə Əmr ibni Əbdəvuda vurduğu qılınc zərbəsi təsəvvür etdiyim hər bir şeydən böyük, hər böyükdən əzəmətlidir. Şeyximiz Əbu Hüzeyldən soruşdum: «Allahın nəzərində Əli (ə) böyük məqama malikdir, yoxsa Əbu Bəkr?» Buyurdu: «Ey qardaşım oğlu, Allaha and olsun, Əlinin (ə) «Xəndək» döyüşündə Əmr ibni Əbdəvudd ilə mübarizəsinin əhəmiyyəti nəinki Əbu Bəkrdən üstündür, hətta ənsar və mühacirlərin bütün yaxşı əməlləri və «!itaətləri ilə bərabərdir

Hüzeyfə ibni Yəmanın Həzrət Əlinin (ə) fəziləti barəsində nəql etdiyi rəvayətdə bu :məsələyə daha dolğun şəkildə işarə olunmuşdur

Qeys ibni Rəbi, Əbu Harun Əbdidən, o da, Rəbiə ibni Malik Vədidən belə nəql edir: Bir» gün Hüzeyfə ibni Yəmanın yanına getdim və ondan soruşdum: «Ey Əba Əbdillah, camaat Əli ibni Əbi Talibin fəzilət və dəyərləri haqqında danışırlar. Elm əhli isə camaata etiraz edib onların Əlinin (ə) haqqında ifrata vardıqlarını söyləyirlər. Siz mənə bu haqda «.bir söz deyin onu camaata çatdırım

Hüzeyfə dedi: Ey Rəbiə, axı mən Əli (ə) kimi bir şəxsiyyətin fəziləti barəsində sənə nə deyə bilərəm?! And olsun o Allaha ki, canım Onun əlindədir, əgər Məhəmməd Peyğəmbərin (s) peyğəmbərlik zamanından bu günəcən ümmətinin bütün yaxşı əməllərini tərəzinin bir gözünə və Əlinin (ə) təkcə bir əməlini tərəzinin o biri gözünə !qoysalar, Əlinin (ə) bir əməli bütün ümmətin əməllərindən ağır gələr

Rəbiə dedi: Sənin dediyin bu tərif Əlini (ə) həddindən artıq şişirtməkdir. Mənə elə gəlir .ki, bu, reallıq deyil

Kənzül-Ummal»,c.۵. səh.۶۷۸; «Əl-hədis»,c.۱۴. səh.۱۷۹ ; «Əl-kamil fit-tarix»,c.۲» . [۱] -۱
səh.۴۲۵; «Tarixi Təbəri»,c.۳. səh.۴۲۹ ; «Ət-təbəqatul Kübra»,c.۳. səh.۲۰۰ ; «İbni Həbban»,c.۲.
.səh.۱۹۲

Hüzeyfə dedi: Ey düşüncəsiz! Necə yə`ni bu reallıq deyil?! «Xəndək» döyüşündə müsəlmanlar harada idilər?! Əmr ibni Əbdəvudd öz dəstəsi ilə müsəlmanların üstünə gəlib onları mübarizəyə səsləyəndə, müsəlmanlar qəm-qüssəyə batıb məyus olmadılarmı?! O zaman yalnız Həzrət Əli (ə) onunla mübarizəyə qalxıb onu öldürdü. And olsun o Allaha ki, canım onun əlindədir, Əlinin (ə) bu işi Məhəmməd (s) ümmətinin (bu gündən tutmuş qiyamət gününəcək olan bütün yaxşı əməllərindən üstündür.(١)

## ƏBU HÜZEYL ƏLLAFIN RƏVAYƏT ETDİYİ MÜBAHİSƏ

ƏBU HüZEYL ƏLLAFıN(٢) RəVAYəT ETDIYI MüBAHISə

Əbu Hüzeyl belə nəql edir: Riqqə şəhərinə daxil olduqda mənə dedilər ki, Dirzəkən adlı bir məntəqədə gözəl bəyana malik olan dəli bir kişi yaşayır. Mən o kişini görmək üçün onun evinə getdim. Evə daxil olduqda balışa söykənmiş halda saçını və saqqalını daraqla darayan, əzəmətli bir şeyx gördüm. Salam verdim və o, salamımı aldı, sonra :məndən soruşdu

?Haralısan –

.İraqlıyam –

.Bəli, ədəb-ərkan əhli –

?İraqın harasındansan –

.Bəsrədənəm –

.Təcrübə və elmə malik olanlar –

?Adın nədir –

.Əbu Hüzeyl Əllaf –

?İlahiyyatçı –

.Bəli –

:Bu zaman o qalxıb, balışın üzərində əyləşdi. Bir müddət söhbətdən sonra soruşdu

?İmamət barədə nəzərin nədir –

?Hansı imamətdən soruşursan –

?Peyğəmbərdən (s) sonra kim imam olmalı idi –

.Peyğəmbərin (s) seçdiyi şəxs –

?O kimdir –

!Əbu Bəkr –



---

.Şərhi nəhcül-bəlağə»,c.١٩. səh.۶٠» . [١] -١

O, BəSRəNIN şEYXI, BöYüK ALIMI Və öZ MəZHəBINDə BIRçOX TəLIFATA . [٢] -٢ MALIK OLAN MəHəMMəD IBNI HüZEYL IBNI ABDULLAH IBNI MəKHUL BəSRI IDI. («MüRəVVIUL-ZəHəB», C.٢. SəH.٢٩٨, «TəBəQATUL-MöTəZILə», SəH.۴۴, «TARIXU (.BəğDAD», C.٣. SəH.٣۶۶. «VəFəYATUL əYAN», C.۴. SəH.٢۶۵

?Ey Əbu Hüzeyl! Hansı dəlilə əsasən belə danışırsan –

Çünki, Peyğəmbərin (s) özü buyurmuşdur: «Ən yaxşınızı qabağa keçirdin, ən – «.fəzilətlinizi rəhbər seçin. Bütün insanlar belə bir şəxsin imamətinə razılaşarlar

Ey Əbu Hüzeyl! Axı Peyğəmbərin (s) buyurduğu kimi olmadı... Sən ki, deyirsən – Peyğəmbər (s) buyurmuşdu: «Ən yaxşınızı qabağa keçirdin, ən fəzilətlinizi rəhbər seçin», halbuki, Əbu Bəkrin özü minbərə çıxıb dedi: «Mən sizin rəhbərinizəm, lakin sizin ən yaxşınız deyiləm.(١) Məxsusən, o vaxta qədər ki, Əli sizin aranızdadır.» Deməli, əgər camaat onun xilafətinə razı oldularsa Peyğəmbərin (s) əmrilə müxalifət etmiş sayılırlar; yox əgər Əbu Bəkrin özü öz haqqında yalan danışırsa təbiidir ki, .Peyğəmbərin (s) minbəri yalançıların yeri deyildi

Bundan əlavə, sən ki deyirsən «hamı onun xəlifə olmasına razı idi», heç də belə deyil. Çünki ənsarın çoxu deyirdilər: «İki rəhbər olsun: biri bizdən, biri də sizdən (Qüreyşdən).» Zübeyr ibni Əvam isə dedi: «Əlidən başqa heç kimlə beyət etməyəcəyəm.» Bu zaman ona əmr olundu ki, sakit olsun və qılıncını da zorla alıb sındırdılar. Həmçinin Əbu Süfyan ibni Hərb Əliyə dedi: «Ey Əbu Həsən (Həzrət Əlinin künyəsidir), əgər istəsən şəhəri at və silahlı süvarilərlə dolduraram.» (Və sənin xəlifə olmağını tələb edərik.) Habelə, Salman ayağa qalxıb fars dilində dedi: «Ağlınıza nə gəlirsə, onu edir və nə etdiyinizi də «.bilmirsiniz

Həmçinin, Miqdad, Əbuzər və bir çox mühacir və ənsar Əbu Bəkrin xilafətilə müxalif .idilər

Ey Əbu Hüzeyl! Məgər Əbu Bəkr minbərə qalxıb demirdi «Mənim başımın üstündə məxsus bir şeytan durubdur ki, məni havalandırır. Siz hər vaxt gördünüz ki, mən (qəzəbliyəm, mənə yaxınlaşmayın!»?(٢

Mən sizin heç bir işinizə qarışmıram; ancaq bunu deyirəm ki, bir adam minbərə çıxıb «Ay camaat, mənim bəzən dəliliyim tutur.» deyirsə, necə özünüzə icazə verirsiniz ki, !?ona itaət edəsiniz

Ey Əbu Hüzeyl! Ömərin sözünə nə deyirsən?! Ömər bir vaxtlar deyirdi ki, mən Əbu

bir müddətdən sonra dedi: «Əbu Bəkrin hökuməti şər`i və qanuni deyil. Allah bizi onun şərrindən qorusun! Hər kəs sizi, belə bir şəxsin hakimiyyətinə səs verməyə çağırarsa, onu öldürün!»(1)

Ömər bir dəfə deyir ki, mən Əbu Bəkrin sinəsində bir tükəm, başqa yerdə isə deyir: hər kəs Əbu Bəkr kimi şəxsə səs verərsə onu öldürün.

Əbu Hüzeyl! Axı bir şəxs Peyğəmbərin özündən sonra xəlifə tə`yin etmədiyini, lakin Əbu Bəkrin özündən sonra xəlifə tə`yin etdiyini, Ömərin isə (şura təşkil edərək) müəyyən bir şəxsi xəlifə tə`yin etmədiyini deyə güman edirsə ziddiyyətli danışmırmı?!

Əbu Hüzeyl! Çox yaxşı bilirsən ki, Ömər altı nəfərdən ibarət şura təşkil etdi. O inanırdı ki, onlar cənnət əhlidirlər. Lakin bununla belə, dedi: «Əgər iki nəfər dörd nəfərlə müxalif olarsa, o iki nəfəri öldürün. Yox, əgər üç nəfər o biri üç nəfərlə müxalifət edərsə, hansı dəstədə ki, Əbdürrəhman yoxdur, o dəstəni öldürün.» İndi de görüm, cənnət əhlinin qətlinə fərman vermək dindarlıqdırmı?!

Əbu Hüzeyl! Abdullah ibni Abbas nəql edir ki, Öməri qəmgin halda görüb soruşdum: Ey möminlərin əmiri, niyə qəm-qüssəlisən?

– İbni Abbas, qəm-qüssəm ölümümün yaxınlaşmasına görə deyil, məndən sonra kimin xəlifə olacağına görədir!

– Özündən sonra Təlhə ibni Übeydullahı xəlifə tə`yin et.

– O, daşürəklidir. Peyğəmbər onu yaxşı tanıyırdı. Mən daşürəkli adamı müsəlmanların rəhbəri təyin etmərəm.

– Zübeyr ibni Əvamı xəlifə tə`yin et.

– O, paxıl adamdır!

– Sə`d ibni Əbi Vəqqası xəlifə təyin et!

– Onun işi at çapmaq, ov ovlamaqdır. Onun xəlifə olmağa əsla ləyaqəti yoxdur.

.Abdullah ibni Ovfi xəlifə tə`yin et –

...O, ailəsinin öhdəsindən yaxşı gələ bilmir, o ki qalmışdı –

.Əgər belədirsə onda, Abdullah ibni Ömәri xəlifə tə`yin et –

Ömər əyləşib dedi: – Sən istəyirsən ki, öz arvadını necə boşamağı bilməyən şəxsin !?xəlifə olmasını vəsiyyət edim

.Yaxşı, Osman ibni Əffanı seç –

səh:۸۲

---

Tarixi-Təbəri» c.۳. səh.۲۰۰» . [۱] -۱

Allaha and olsun, əgər onu xəlifə seçsəm Bəni-Üməyyə və Əbi Müeyt tayfasını – müsəlmanların boynuna mindirəcək və bunun nəticəsində tezliklə onu öldürəcəklər. (.(Ömər bu cümləni üç dəfə təkrar etdi

İbni Abbas deyir: Neçə nəfərin adını xilafət üçün təklif etdikdən sonra sakit qaldım. .Ömərin Həzrət Əli (ə) ilə olan düşmənçiliyini bildiyim üçün o həzrətin adını çəkmədim

!Ey İbni Abbas, dostunun da adını çək –

.Əlini xəlifə tə`yin et –

Ömər dedi: Allaha and olsun, narahatlığım yalnız buna görədir ki, haqqı (xilafəti) öz sahibindən (Əlidən) almışıq. İlahiyə and olsun, əgər Əlini xəlifə tə`yin etsəm, müsəlmanları haqq və ədalət yoluna çəkəcək. Əgər xalq ona itaət etsələr hamısını .behiştə aparacaq

(Ömər bu sözləri desə də, sonradan altı nəfərdən ibarət şura təşkil etdi...(١)

## MÜZAKİRƏMİZİN XÜLASƏSİ

MüZAKIRəMIZIN XüLASəSI

Əbu Hüzeylin Riqqə şəhərində yaşayan şəxslə mübahisəsi, demək olar ki, bizim bu kitabda söylədiklərimizin bir növ xülasəsidir. Əgər o mübahisəni bir daha nəzərinizə :çatdırmaq istəsək, aşağıdakı bəndlərə işarə edə bilərik

Əbu Bəkrin xilafətinin şər`i və qanuni olmasına dair iddia olunan ən böyük dəlil, onun .١ üstün olması və icma tərəfindən seçilməsi idi. Biz də qabaqkı bəhslərimizdə onun başqalarından heç cür üstün olmamasını və icma tərəfindən xilafətə seçilməməsini .isbat etdik

Ömər, Əbu Bəkrin xilafətinin qeyri-qanuni olması haqda belə dedi: «Onun hökuməti .٢ şər`i və qanuni deyil. Allah bizi onun şərrindən qorusun!» Halbuki, Ömərin özü də Əbu Bəkrin vəsiyyəti ilə xilafətə yetişdi. Lakin onun öz dediklərinə əsasən, Əbu Bəkrin .xilafətə yetişmək üslubu düzgün deyildi

Şura üzvlərinə hədsiz dərəcədə qabalıq, kobudluq göstərildi. Axı, əgər onlar .٣ doğrudan da (Ömərin öz dediyinə əsasən) cənnət əhli idilərsə, onların qətlinə necə əmr oluna bilər?! Həmçinin, hansı dəlilə əsasən Əbdürrəhman ibni Ovfun olduğu üç !!?nəfərlik dəstə məqbul sayılırdı

Ömər bütün namizədlərin xilafətə səlahiyyətli .۴

səh:٨٣

---

Əl-ehticac», c.٢. səh.١۵٠» . [١] -١

olmamalarına təkid etsə də, lakin həzrət Əlinin (ə) bu işə layiq olmasına etiraf etdi. Buna baxmayaraq Həzrət Əlidən (ə) haqqı (xilafəti) uzun müddət olaraq kənarlaşdırdılar. Bu işi də şura etdi!!

«Haqqa tərəf yönəldən şəxs itaətə daha layiqdir, yoxsa haqqı tanımayan və haqqı tanımaqda digərinə möhtac olan şəxs?! Siz necə hökm edirsiniz?» (Yunus, ۳۵)

İlahi, Sənə şükürlər olsun ki, bizi Həzrət Əlinin (ə) aşiqlərindən qərar verdin!

## MƏNBƏLƏR


Qur`ani-Kərim .۱

Nəhcül-Bəlağə .۲

Şafei. Əl-umm .۳

Diynəvəri. Əl-imamətu vəs-siyasə .۴

Amədi. Əl-ehkamu fi üsulil-əhkam .۵

Əbul-Fərəc İsfəhani. Əl-əğani .۶

Səm`ani. Əl-ənsab .۷

Əsqəlani. Əl-isabə .۸

Təbərsi. Əl-ehticac .۹

Məqrizi. Əl-imtau vəl-əsma .۱۰

İbni Bətta. Əl-ibanə .۱۱

Zubeydi. İthaful-sadət .۱۲

Qurtəbi. Əl-istiyab .۱۳

Usəsut-təqəddüm .۱۴

Cəzəri. Usdul-ğabə .۱۵

Əbu Zohrə. Əbu Hureyrə .۱۶

Qəstəlani. İrşadus-sari .۱۷

Qəzzali. Əl-irşadu fil-kəlam .۱۸

ƏbuRəyyə. Əzvaun ələssünnətil-mühəmməd.۱۹

Bülazəri. Ənsabul-əşraf .۲۰

Məclisi. Biharul-ənvar .۲۱

İbni Kəsir. Əl-bidayətu vən-nihayə .۲۲

(Zəhəbi. Tarixul-İslam (Əl-xüləfa .۲۳

(Zəhəbi. Tarixul-İslam (Müaviyə .۲۴

Təbəri. Tarixul-üməm vəl-müluk .۲۵

Buxari. Ət-Tarixul-Kəbir .۲۶

İbni Əsakir. Tarixu-Mədinəti-Dəməşq .۲۷

İbni Vazeh. Tarixul-Yə`qubi .۲۸

İbni Şubbi. Tarixul-Mədinətil-Münəvvərə .۲۹

Süyuti. Tarixul-xüləfa .۳۰

۳۱. Mənna Qəttan. Tarixüt-təşri

۳۲. Xəlifə ibni Xəyyat. Tarixul-xəlifə

۳۳. Zubeydi. Tacul-Ərus

۳۴. Ət-tacu fi əxlaqil-müluk

۳۵. Sibt ibni Covzi. Təzkirətul-xəvass

۳۶. Qəsrəvani. Təzkirətul-mövzuat

۳۷. Kəvsəri. Təkmilətul-seyfil-seyqəl

۳۸. Bəğdadi. Təfsirul-xazen

۳۹. İbni Kəsir. Təfsirul-Qur`anil-əzim

۴۰. Bəğəvi. Təfsirul-Bəğəvi

۴۱. Süyuti. Təfsirud-dürrul-mənsur

۴۲. Alusi. Təfsirul-ruhul-məani

۴۳. Qummi. Təfsirul-Qummi

۴۴. TəbaTəbai, Təfsirul-Mizan

۴۵. Əsqəlani. Təqribut-Təhzib

۴۶. Əsqəlani. Təhzibut-Təhzib

۴۷. Məzzi. Təhzibul-kəmal

۴۸. İbni Şahin. Əs-siqat

۴۹. İbni Həbban. Kitabus-siqat

۵۰. Əxlaq Ravi. Əl-came

Qurtəbi. Əl-cameu li-Əhkamil-Qur`an .۵۱

İbni Covzi. Əl-covhərul-münəzzəm .۵۲

Əndulusi. Cəmhərətul-xutəb .۵۳

Əl-həzrətul-insiyyə .۵۴

Əbu Nəim İsbəhani. Hilyətul-Əvliya .۵۵

Səduq. Əl-xisal .۵۶

Nəraqi. Xəzain .۵۷

Əsqəlani. Əd-dürərul-Kaminə .۵۸

Beyhəqi. Dəlailun-nübüvvət .۵۹

Zəməxşəri. Rəbiul-əbrar .۶۰

Səqaf. Əs-sələfiyyətul-vəhabiyyət .۶۱

Zəhəbi. Siyəru ə`lamil-nübəla .۶۲

Beyhəqi. Əs-sunənul-kubra .۶۳

Nəsai. Əs-sünən .۶۴

Termizi. Əs-sünən .۶۵

İbni Hişam. Əs-sirətun-Nəbəviyyə .۶۶

Sərbazi. Şəhsəvari Kərbəla .۶۷

Qazi No`man. Şərhül-əxbar .۶۸

İbni Əbil-Hədid. Şərhu Nəhcül-bəlağə .۶۹

Nəvəvi. Şərhul-məqasid .۷۰

Təftazani. Şərhul-məqasid .۷۱

İbni İmad-Hənbəli. Şəzəratuz-Zəhəb .۷۲

Səalibi. Əş-şəkva vəl-itab .۷۳

Əbdür-Rəhim Xətib. Şeyxəyn .۷۴

Buxari. Səhihul-Buxari .۷۵

Nişapuri. Səhihul-Müslim .۷۶

۷۷. Heysəmi. Əs-Səvaiqul-Muhriqə

۷۸. Əhməd Əmin. Zuhəl-İslam

۷۹. İbni Sə`d. Ət-təbəqatul-Kübra

۸۰. Əndolsi. Əl-əqdul-fərid

۸۱. Amili. Əqlul-Yəhudil-əsir

۸۲. Eyni. Ümdətül-Qari

۸۳. Mənavi. Feyzul-Qədir

۸۴. Şəvkani. Fəthul-Qədir

۸۵. Əsqəlani. Fətluh-Bari

۸۶. Dəftəre mütaliate din-Qum. Fəryade Fatimə

۸۷. Bəlazeri. Fütuhul-buldan

۸۸. Şəvkani. Əl-fəvaidul-məcmuə

۸۹. İbni Əsəm. Əl-Kufi. Əl-futuh

۹۰. Əzhəri. Fürqanul-Qur`an

۹۱. Heysəmi. Əl-fətavəl-hədisiyyə

۹۲. Xətibul-Bəğdadi. Əl-Fəqih vəl-mütəfəqqih

۹۳. Firuz Abadi. Əl-qamus

۹۴. Kəbi. Qəbulul-əxbar

۹۵. İbni Əsir. Əl-kamil fit-tarix

۹۶. İbni Ədi. Əl Kamil fiz-züəfa

İmadəddin Təbəri. Əl-kamil lil-Bəhai .۹۷

Qummi. Əl-kuna vəl-əlqab .۹۸

Hindi. Kənzul-ümmal .۹۹

Məhəllati. Kəşful-haviyə .۱۰۰

Xətib Bəğdadi. Əl-kifayə fi elmid-dirayə .۱۰۱

Seyyid Qutb. Kutub və şəxsiyyat .۱۰۲

Əsqəlani. Lisanul-mizan .۱۰۳

İbni Mənzur. Lisanul-ərəb .۱۰۴

Süyuti. Əl ləalil-məsnuə .۱۰۵

İbni Covzi. Əl-mövzuat .۱۰۶

Əhməd ibni Hənbəl. Əl-müsnəd .۱۰۷

Rəlul. Movsuətu ətrafil-hədis .۱۰۸

Hərrani. Minhacus-sünnə .۱۰۹

Malik ibni Ənəs. Əl-müvəttə .۱۱۰

Əbul-Fərəc İsabəhani. Məqatilul-Talibiyyin .۱۱۱

Məs`udi. Mürucuz-zəhəb .۱۱۲

Xarəzmi. Əl-mənaqib .۱۱۳

Rağib. Muhaziratul-Üdəba .۱۱۴

Haşimi. Muhəbbər .۱۱۵

Əl-məvahibul-lədunniyyə .۱۱۶

!Kənci.Muaviyə ra behtər beşenasim.۱۱۷

İbni Covzi. Əl-münəzzəm .۱۱۸

Nişaburi. Əl-müstədrək ələs –səhihəyn .۱۱۹

Nuri. Müstədrəkatul-vəsail .۱۲۰

Mənazi. Müstədrəkatu elmi ricalil-hədis .۱۲۱

Təbəsi. Məvaridul-secən .۱۲۲

۱۲۳. İbni Həbban. Əl-Məcruhin

۱۲۴. Hindi. Müntəxəbu kənzil-ümmal

۱۲۵. Təbərani. Əl-mo`cəmul-kəbir

۱۲۶. Kəlbi. Məsalibul-ərəb

۱۲۷. Səid Əyyub. Məalimul-fitən

۱۲۸. İbni Əbu Şeybə. Əl-müsənnəf

۱۲۹. Sən`ani. Əl-müsənnəf

۱۳۰. Heysəmi. Məcməuz-zəvaid

۱۳۱. Təbrizi. Mişkatul-məsabih

۱۳۲. Nəvəvi. Əl-məcmu

۱۳۳. Zəhəbi. Mizanul-e`tidal

۱۳۴. İbni Bədran. Müxtəsəru tarixi- Dəmeşq

۱۳۵. Diynəvəri. Əl-məarif

۱۳۶. Hakim Nişapuri. Mərifətu ülumil-hədis

۱۳۷. Milani. Əl-muhazirat

۱۳۸. Sübhani. Əl-miləl vən-nihəl

۱۳۹. Şəhristani. Əl-miləl vən-nihəl

۱۴۰. Vaqidi. Əl-məğazi

۱۴۱. Yusifi. Mövsuətul-tarixil-İslami

۱۴۲. İbni Həzm. Əl-Mühəlla

İyci. Əl-Məvaqif fil elmil-kəlam .۱۴۳

Təbəsi. Ən-nəfyu vət-təğrib .۱۴۴

İbni Əsir. Ən-nihayə .۱۴۵

Minqəri. Vəq`ətu Sifføyn .۱۴۶

İbni Xullәkan. Vəfəyatul-ə`yan .۱۴۷

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹